"Azərbaycan Dövlət Pedaqoji Universitetinin mətbu orqanı"

# GƏNC MÜƏLLİM QƏZETİ



"Müəllimlər müəllimi olmaq ikiqat şərəfli və eyni zamanda, ikiqat məsuliyyətli işdir!"

H.Əliyev

***"Həm orta məktəblərdə, həm də ali məktəblərdə müəllimlərin üzərinə çox böyük vəzifə düşür. Çünki bizim gənclərimizin vətənpərvərlik ruhunda tərbiyə olunmasında onların çox böyük rolu olmuşdur, bu gün də var. İki tərbiyə mənbəyi var - ailə və müəllim".***

Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin Qarabağ Universitetinin təmirdən sonra açılışında nitqindən
Xankəndi, 20 sentybar 2024-cü il








































*1921-ci ildən təhsilimizin keşiyində...*

Qəzet 1958-ci il, fevral ayının 1-dən etibarən nəşr olunur. | Sentyabr 2024 / № 3 (1128)

# Çağdaş təhsilin innovativ hədəfləri

Yaxın illərdə Azərbaycan bu sahədə öncül ölkələrdən biri olacaq

**Müsahibimiz Azərbaycan Dövlət Pedaqoji Universitetinin rektoru, tarix elmləri doktoru, professor Cəfər Cəfərovdur**



Ölkənin islahatçı təhsil qurucularından sayılan Cəfər Cəfərov müxtəlif illərdə BDU-nun tarix fakültəsinin dekan müavini, Gənclər və İdman Nazirliyinin gənclərlə iş baş idarəsinin rəisi vəzifələrində çalışmış, BMT İnkişaf Proqramı və Azərbaycan hökumətinin bir sıra layihələrində milli koordinator olmuşdur. 2000-2001-ci illərdə Fulbrayt proqramının qalibi kimi Nyu-York Universitetinin Dövlət İdarəçiliyi Məktəbində tədqiqatçı alim vəzifəsində çalışmış, BMT-nin mərkəzi qərargahında "Elektron hökumət" layihəsinin icraçılarından biri olmuşdur. O, Dünya Azərbaycanlılarının I Qurultayında qurumun Əlaqələndirmə Şurasının İdarə Heyətinin üzvü seçilmiş, 2003-2004-cü illərdə Beynəlxalq Mətbuat Mərkəzinin direktoru vəzifəsində işləmişdir.

Azərbaycan tarixinin müasir problemləri, turizm və ali pedaqoji təhsilin inkişaf perspektivləri ilə bağlı respublikada və xaricdə nəşr olunan 90-dan çox kitabın, tədris-metodiki vəsaitin, elmi məqalənin müəllifi, professor Cəfər Cəfərov 2006-2014-cü illərdə Azərbaycan Turizm İnstitutunun, 2014-2016-cı illərdə onun bazasında yaradılmış Azərbaycan Turizm və Menecment Universitetinin rektoru olmuşdur. Bütün bu məsul vəzifələrdə təşəbbüskarlıq və məsuliyyətlə çalışmış alim-pedaqoq Prezident İlham Əliyevin 23 iyun 2016-cı il tarixli sərəncamı ilə Azərbaycan Dövlət Pedaqoji Universitetinin rektoru təyin olunmuşdur.

Ötən dövrdə ali təhsil ocağında bir sıra islahatlar və yeniliklər həyata keçirilmiş, tədrisin məzmunu və maddi-texniki bazası yenilənmiş, abituriyentlərin MİQ və digər imtahanlarda, karyera inkişaflarında əhəmiyyətli irəliləyişlər baş vermişdir.

Professor Cəfər Cəfərov Avstriyanın IMC/FH KREMS Universitetinin fəxri doktoru, Avrasiya İpək Yolu Universitetləri Konsorsiumu İcraedici Şurasının üzvü, ADPU-da fəaliyyət göstərən Dissertasiya Şurasının sədri, eləcə də bir neçə yerli və beynəlxalq elmi jurnalların baş redaktoru və redaksiya heyətinin üzvüdür. Soydaşımız bir müddət Türkiyənin Ali Təhsil Keyfiyyət Şurasının xarici qiymətləndiricisi kimi fəaliyyət göstərmişdir. Cəfər Cəfərov "Şöhrət" ordeni və bir sıra medallarla təltif olunmuşdur.

**- Cəfər müəllim, istərdik, söhbətə ölkənin qocaman və nüfuzlu ali məktəblərindən birinin rektorunun təhsilin və müəllimin cəmiyyətdəki rolu və ölkəmizdə bu sahədə aparılan işlərə münasibəti ilə başlayaq.**

- Təbii ki, təhsil hər bir fərdin və cəmiyyətin həyatında olduqca mühüm rol oynayan zəruri bir resursdur. Cəmiyyətin təhsil səviyyəsi o xalqın həyat tərzini, bəşəri sivilizasiyada qazandığı uğurları, tərəqqiyə verdiyi töhfələri və çağdaş inkişafda tutduğu yeri şərtləndirən amildir. Təhsil millətin gələcəyə etdiyi ən dəyərli və gəlirli yatırım, özünün varlığı və inkişafının qarantıdır. Elə bu kontekstdən yanaşdıqda təhsil prosesinin əsas elementi və bu prosesin mərkəzində rol alan fiqur kimi müəllim ön plana çıxır. Məhz müəllimlərin gərgin əməyi və səyi nəticəsində yetişən nəsillər yeni-yeni bilik və bacarıqlara yiyələnir, onlarda milli vətənpərlik ruhu, eyni zamanda, ümumbəşəri humanist və əxlaqi dəyərlər daha da dərindən təşəkkül tapır. Ulu Öndər Heydər Əliyev və Ümummilli Liderin siyasi kursunun layiqli davamçısı Prezident İlham Əliyev milli təhsil sisteminin inkişaf etdirilməsi və dünyanın qabaqcıl təhsil sistemləri arasında özünə layiqli yer tutaraq rəqabətqabiliyyətliliyinin təmin olunması istiqamətində ardıcıl tədbirlər həyata keçirmişlər. Bu tədbirlər bu gün də dövlət başçısının siyasətində ən vacib prioritetlər arasında yer alır. Bunlara misal olaraq "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası", "Azərbaycan 2030: sosial-iqtisadi inkişafa dair Milli Prioritetlər", "Azərbaycan Respublikasının 2022-2026-cı illərdə sosial-iqtisadi inkişaf Strategiyası", "2019-2023-cü illər üçün Azərbaycan Respublikasında ali təhsil sisteminin beynəlxalq rəqabətliliyinin artırılması üzrə Dövlət Proqramı", "Gənclərin xarici ölkələrin nüfuzlu ali təhsil müəssisələrində təhsil almalarına dair 2022-2026-cı illər üçün Dövlət Proqramı" kimi konseptual sənədləri göstərmək olar.

Müzəffər Ali Baş Komandan İlham Əliyevin rəhbərliyi ilə 2020-ci ilin 44 günlük Vətən müharibəsində doğma torpaqlarımızı işğaldan azad edən rəşadətli Azərbaycan Ordusunun əsas hissəsi son 20 ildə milli təhsil və dövlət gənclər siyasətinin yetirmələri olan savadlı, bacarıqlı, eyni zamanda vətəni hər şeydən çox sevən igid gənclərimizdən ibarət idi. Hansı ki, bu gün həmin gənclərin azad etdiyi doğma torpaqlarımıza - Qarabağ və Şərqi Zəngəzura obrazlı formada belə ifadə etmək olarsa, "təhsillə" dönürük. Ağalı kənd məktəbi ilə başlayan bu estafet artıq böyük yol qət edərək Füzuli, Laçın, Şuşadan keçib, yeni tədris ilində öz tələbələrini qarşılamağa və qapılarını bütün dünyaya açmağa hazırlaşan Qarabağ Universitetinə çatıb.

**- Qeyd etdiyiniz kimi, doğma Qarabağ və Şərqi Zəngəzurda bu gün sürətli bərpa-quruculuq işləri və bölgəyə "Böyük Qayıdış" prosesi həyata keçirilir. Yeni tədris ilindən işğaldan azad olunmuş ərazilərdə ilk universitet olan Qarabağ Universiteti fəaliyyətə başlayır. Bölgəyə həyatın yenidən qayıtması və təhsil sisteminin inkişafının ölkəmizin ümumi inkişafına töhfəsi haqqında fikirlərinizi öyrənmək istəyərdik.**

- Vurğulanmalıdır ki, Azərbaycan Prezidentinin 2022-ci il 16 noyabr tarixli sərəncamı ilə təsdiq edilmiş "Azərbaycan Respublikasının işğaldan azad edilmiş ərazilərinə Böyük Qayıdışa dair I Dövlət Proqramı"na uyğun olaraq, bu ərazilərin yenidən qurulması, dayanıqlı inkişafı və burada yüksək həyat səviyyəsinin təminatı üçün genişmiqyaslı bərpa-quruculuq işləri həyata keçirilir.

Bununla bağlı regionda əhalinin dayanıqlı məskunlaşmasının təmin olunmasının ən vacib elementi burada təhsil sisteminin yenidən qurulması və ölkə təhsil sisteminə reinteqrasiya edilməsi məsələsidir. Bildiyimiz kimi, 2022-ci ildə başlayan Böyük Qayıdış prosesi bu gün də sürətlə davam edir. Bu prosesdə orta ümumtəhsil məktəbləri ilə yanaşı, regionda müvafiq ixtisaslaşmış təhsil müəssisələrinin, mədəniyyət mərkəzlərinin, ən əsası isə ali təhsil ocaqlarının fəaliyyətə başlaması ən mühüm həlqələrdəndir.

Qarabağ regionunda ümumtəhsil sistemi ilə yanaşı, tarixən ali təhsil ənənəsi də mövcud olmuşdur. Fəxarət hissi ilə deyə bilərik ki, burada ilk ali təhsil ocağı Ulu öndərin təşəbbüsü ilə 1969-cu ildə ozamankı Azərbaycan Pedaqoji İnstitutu, indiki Pedaqoji Universitetin filialı kimi qurulmuşdur. İnstitut 1973-cü ildən 1988-ci ilədək ali təhsil müəssisəsi kimi fəaliyyət göstərmiş, ərazilərimizin mənfur düşmənlər tərəfindən işğalı dövründə fəaliyyətini dayandırmışdır.

Torpaqlarımızın işğaldan azad olunmasından sonra məhz bu ənənələri bərpa edərək regionun potensialını yenidən özünə qaytarmaq məqsədilə Prezident İlham Əliyev Xankəndi şəhərində mövcud olmuş ali təhsil müəssisəsinin bazasında dünyaya elm və təhsil, mədəniyyət mərkəzi kimi səs salacaq Qarabağ Universitetinin yaradılması haqqında 28 noyabr 2023-cü il tarixli Sərəncam imzalamışdır. Qüdrətli və qalib Azərbaycanın sülh simvollarından birinə çeviriləcək Qarabağ Universiteti artıq növbəti tədris ilində öz tələbələrini qarşılamağa hazırlaşır.

Regiondakı inkişafın, məskunlaşma və təhsil infrastrukturunun yenidən qurulmasının ölkəmizin ümumi inkişafına verəcəyi töhfəyə gəldikdə isə, qeyd olunmalıdır ki, Qarabağ bölgəsinin zəngin mədəni ənənələrinin, eləcə də böyük iqtisadi potensialının yenidən ölkə həyatına inteqrasiya olunmasının bir tərəfdən Azərbaycanın iqtisadi-sosial inkişafına əhəmiyyətli qatqısı olacaqsa, digər tərəfdən bu 30 ildən artıq müddətdə ardıcıl urbisidə məruz qalmış, tamamilə xarabalığa çevrilmiş, nəhayət, qətiyyətli siyasi iradə və "dəmir yumruq" hesabına, qüdrətli Azərbaycan Ordusunun gücü ilə işğaldan azad olunmuş onlarla şəhər, qəsəbə və kəndlərin yenidən çiçəkləndirilməsi, bu ərazilərdən didərgin düşən insanların öz yurd-yuvalarına qayıtmaları ilə bütün dünyaya böyük bir humanizm və quruculuq - sülh mesajı verəcək, Azərbaycanın bütün ərazilərində əbədi suverenliyimizin carçısı olacaqdır.

**- Ölkəmiz bu il dünya birliyinin ən nüfuzlu toplantılarından biri olan COP29-u keçirməyə hazırlaşır. Eyni zamanda, 2024-cü il Azərbaycanda "Yaşıl dünya naminə həmrəylik ili" elan olunub. Bu mötəbər tədbir və ekoloji il, şübhəsiz, təhsil sferası üçün də önəmli hədəflər müəyyən edib.**

- Bəli, COP29 dünya birliyinin bəşəriyyətin problemlərini müzakirə etdiyi ən mötəbər və böyük miqyaslı tədbirlərindən biri olmaqla ona rəhbərlik edən ölkənin də beynəlxalq arenadakı nüfuzu və etibarını nümayiş etdirir. Bu baxımdan hər şeydən öncə COP29-un ölkəmizdə keçirilməsi haqqında qərarın özü Azərbaycanın artan nüfuzunun və gücünün göstəricisidir. Digər tərəfdən, COP29 ərəfəsində on minlərlə turist və rəsmi qonaqlar, eləcə də siyasətçilər, ziyalılar, alimlər, ekoaktivistlər ölkəmizə səfər edəcəklər.

Bunlar birləşib Azərbaycan həqiqətləri, ölkənin zəngin mədəniyyəti və böyük turizm potensialının tanıdılması üçün unikal fürsət, eyni zamanda böyük bir həmrəylik festivalı olacaqdır. Həmçinin bu çərçivədə təbiətə qayğı, təbii mühitin qorunması və inkişaf etdirilməsi məsələləri ən yüksək səviyyədə bir daha diqqət mərkəzinə gətirilir, ölkəmiz yaşıl dünyamızı qorumaq naminə bütün dünyaya həmrəylik çağırışı edir.

Bu həm də iqlim dəyişikliyi kimi qlobal ekoloji problemin həlli istiqamətində beynəlxalq birliyin çıxış yollarını axtardığı və dünyanın dayanıqlı inkişafı naminə müvafiq qərarlar alacağı olduqca əhəmiyyətli bir tədbirdir.

Sadalananları ümumiləşdirsək, COP29 və "Yaşıl dünya naminə həmrəylik ili" ölkəmizin həyatında mühüm dəyişikliklərə vəsilə olacaq mötəbər hadisələr kimi qiymətləndirilə bilər. Xüsusən, təhsil sahəsində təbiətə daha həssas yanaşma,

ətraf mühitin və biomüxtəlifliyin mühafizəsi üçün ictimai-mədəni təfəkkür səviyyəsinin daha da yüksəldilməsi baxımından əhəmiyyəti böyükdür.

Biz təkcə cəmiyyət arasında deyil, müxtəlif tədbirlərin görülməsində, təhsil proqramlarının məzmununda, yeni yetişən gənclərimizin təfəkkürlərinin formalaşmasında bu müsbət dinamikanın şahidi olacağıq. Minilliyin inkişaf məqsədlərinin, o cümlədən ekoloji mədəniyyətin yeni nəsildə daha təsirli formalaşması təhsilin əsas məzmun xətlərindən biri kimi təhsil ictimaiyyətinin diqqət mərkəzində olmalıdır.

**- Pedaqoji kadrlar hazırlayan bir ali məktəbin rəhbəri olaraq müəllimlərin işə qəbulu və sertifikasiya imtahanları haqqında sizin fikirləriniz oxucular üçün maraqlıdır.**

- Bəli, Azərbaycan Dövlət Pedaqoji Universiteti ölkəmizin müəllimlər ocağı, müəllim kadrlarının yetişdirildiyi əsas mərkəzdir. Təkcə bu faktın özü burada fəaliyyət göstərməyin necə böyük məsuliyyət tələb etdiyinin nümunəsidir. Ulu öndərin vaxtilə Pedaqoji Universitetin professor-müəllim heyəti ilə görüşündə ifadə etdiyi bir fikri yada salmaq istərdim: "Müəllimlər müəllimi olmaq ikiqat şərəfli və eyni zamanda, ikiqat məsuliyyətli işdir".

Əvvəla, ADPU-da bütün müəllimlik ixtisasları üzrə, eləcə də bakalavriat səviyyəsində 25 ixtisas, magistratura səviyyəsində 30 ixtisaslaşma, doktorantura səviyyəsində isə 33 ixtisas üzrə yüksəksəviyyəli kadr hazırlığı həyata keçirilir. Bu ixtisas və ixtisaslaşmalar arasında, eyni zamanda təhsilin aktual sahələri üzrə yeni ixtisaslaşmalar da yer alır.

Pedaqoji Universitetdə son dövrlərdə aparılan islahatlar, yazılı və hibrid imtahan sistemlərinin tətbiqi, 2020-ci ildə bütün ixtisaslar üzrə tədris proqramlarının yenilənməsi, infrastrukturun təkmilləşdirilməsi, eləcə də praktik-laborator imkanların artırılması həm yüksək nəticə göstərən tələbələrin universitetə cəlb olunmalarında, həm də ADPU məzunlarının MİQ imtahanlarında yüksək nəticələr əldə etmələrində özünü göstərir. Bu nəticələr bizi sevindirir və daha da əzmlə çalışmağa ruhlandırır. Bu imtahanlarda istər test mərhələsində, istərsə də müsahibə mərhələsində yüksək nəticə göstərənlər arasında ADPU-nu son illərdə bitirən gənc müəllimlərin üstünlük təşkil etməsi universitetimizin uğur göstəricilərindən sayıla bilər. ADPU məzunlarının nəticələrindən danışmışkən diqqətinizə çatdırmaq istərdim ki, 2023/2024-cü tədris ilində Pedaqoji Universitetin bakalavr proqramlarından məzun olan 2207 nəfərdən magistratura imtahanlarında iştirak edənlərinin 812 nəfəri (36,7 faiz) ixtisas seçimi mərhələsində iştirak etmək hüququ qazanıb. Onlardan 567 nəfəri (cari il məzunlarının 25,6 faizi) Azərbaycanda magistraturaya qəbul olunub. Bu günə olan məlumata görə cari il məzunlarından 69 nəfəri xarici ölkələrin ali təhsil müəssisələrinin magistraturalarına sənəd təqdim edib. Keçən il analoji göstərici 80 nəfər olub. Lakin xarici ölkə universitetlərində magistraturaya qəbul prosesinin hər ilin oktyabr ayınadək davam etdiyini nəzərə alsaq, bu il ötən ilə nisbətən daha yaxşı nəticə əldə olunacağını proqnozlaşdırmaq olar. Ötən il Pedaqoji Universitetdən məzun olan 2025 nəfər bakalavrdan 385 nəfəri (19 faiz) magistraturaya qəbul olunmuşdur.

Pedaqoji Universitet keçən 103 il ərzində böyük bir inkişaf yolu keçmiş, ölkədə ilk Azərbaycandilli ali təhsil ocağı kimi 180 mindən çox pedaqoji kadr hazırlamışdır. Bu dövrdə ADPU-nun Türkiyə, İran, Bolqarıstan, Çin, Yəmən, habelə Rusiya, Gürcüstan, o cümlədən digər keçmiş sovet respublikalarından minlərlə məzunları olmuşdur. Hazırda bu ənənə genişlənərək davam edir. Belə ki, ADPU-nun tələbələri mobillik çərçivəsində Türkiyə, Danimarka, Litva, Polşa, Niderland və Ruminyada təhsillərini davam etdirdiyi kimi, Pedaqoji Universitetdə də Türkiyə, Çin, Rusiya, Gürcüstan, Pakistan, Özbəkistan, Türkmənistan və s. ölkələrdən olan 200-dək əcnəbi tələbə təhsil almaqdadır.

Həmçinin deyim ki, ADPU-nun Məzun koordinasiya və karyera şöbəsi tərəfindən məzunlarımızla daim əlaqə saxlanılır, onların karyera inkişafları izlənilir və müvafiq təhlillər aparılır. Təkcə onu demək kifayəfdir ki, Dövlət Məşğulluq Agentliyi tərəfindən ali təhsil müəssisələri ilə əməkdaşlıq əsasında hazırlanan "Məzunların məşğulluq reytinqi" platformasının təqdim etdiyi məlumatlara əsasən 2018-2021-ci illərdə ADPU məzunlarının 51,6 faizi işlə təmin olunub. Bu da analoji dövrdə ölkə üzrə məzunların ümumi məşğulluq səviyyəsinə yaxın göstəricidir (58,8 faiz) və Pedaqoji Universitet məzunların



işlə təmin olunması üzrə ölkə universitetləri arasında 4-cü yerdədir. Fərdi rəqəmlərə baxdıqda isə əgər 2021-ci ildə Pedaqoji Universitetin məzunlarının ümumi məşğulluğu 63 faiz təşkil edirdisə, bu göstərici 2022-ci ildə 71 faiz, 2023-cü ildə isə 90 faizdən çox olmuşdur.

Müəllimlərin sertifikasiyası və ona görə yüksək nəticə toplayan müəllimlərin rəğbətləndirilməsi olduqca dəyərli addımdır. Heç kimə sirr deyil ki, keçmiş onilliklərdə müxtəlif səbəblərdən kifayət qədər hazırlığı olmayan şəxslər müəllim adını qazanaraq məktəblərə yol tapmış və bu hal məktəbdəki pedaqoji prosesin keyfiyyətinə, ümumilikdə müəllim nüfuzuna neqativ təsir etmişdir. Elm və Təhsil Nazirliyinin apardığı sertifikasiya prosesi ağrılı olsa da, aparılması zəruri olan işdir. İnanıram ki, yaxın bir neçə ildə bütün orta ümumtəhsil məktəblərində bu prosesin yekunlaşması ilə məktəbdə pedaqoji prosesin daha da güclənməsinin, müəllim obrazının daha da yüksəlməsinin şahidi olacağıq.

Bütün bunları nəzərə alaraq deyə bilərəm ki, MİQ və sertifikasiya imtahanları tələbələrimizin təhsil müddətlərində əldə etdikləri bilik və səriştələrin ölçülməsi və onların işlə təmin olunmaları, əməklərinin stimullaşdırılması baxımından olduqca faydalı, mühüm və zəruri bir alətdir.

**- XXI əsrin dəyişən tələbləri qarşıya təhsil sahəsində yeni nəsil tədqiqatçıların və idarəçilərin yetişdirilməsi kimi məsul bir vəzifə qoyur. Rəhbərlik etdiyiniz ali təhsil müəssisəsində bu istiqamətdə hansı addımlar atılır?**

- Bu sahədə dövlət siyasətinin tərkib hissəsi kimi zəruri addımlar atılır və Pedaqoji Universitet olaraq biz də bu tendensiya içərisində öz məsuliyyətimizi dərk edir, adekvat reaksiyalar verməyə çalışırıq. "2019-2023-cü illər üçün Azərbaycan Respublikasında ali təhsil sisteminin beynəlxalq rəqabətliliyinin artırılması üzrə Dövlət Proqramı" çərçivəsində həyata keçirilən Azərbaycan Dövlət Pedaqoji Universitetinin Amerika Birləşmiş Ştatlarının Corc Vaşinqton Universiteti ilə birgə "Təhsil siyasəti və idarəetməsi" ixtisası üzrə ikili diplom magistr proqramı, ADPU-nun Strateji İnkişaf Mərkəzinin Elm və Təhsil Nazirliyi ilə birgə icra etdiyi dövlət ümumi təhsil müəssisələrində direktor vəzifəsində çalışan və ya çalışmaq arzusunda olan pedaqoji kadrların idarəetmə ilə bağlı bilik və bacarıqlarının təkmilləşdirilməsinə dəstək göstərən peşəkar inkişaf proqramı olan "Məktəb liderliyi" proqramı, eləcə də universitetdə magistratura səviyyəsində son illər kadr hazırlığına başlanılmış "Təlim və təhsilin təşkili və metodikası (SABAH)", "Menecment (təhsilin təşkili və idarə olunması)", "Menecment (ali təhsilin təşkili və idarə olunması)", eləcə də MBA proqramı üzrə "Təhsilin təşkili və idarə olunması" və "Marketinq (təhsil üzrə marketinqin təşkili və idarə olunması)" kimi yeni ixtisaslamalar bu sahədə icra olunan kompleks və ardıcıl fəaliyyətə misal ola bilər. Bir məsələyə də toxunum. Bu, Azərbaycanın da bir neçə ildir iştirak etdiyi Beynəlxalq Şagird Qiymətləndirmə Tədqiqatlarıdır. Hansı ki, bu tədqiqatların ölkəmizdə həyata keçirilməsi və nəticələrinin təhlil olunmasında ADPU-nun Strateji İnkişaf Mərkəzi yaxından iştirak edir. Belə ki, TIMSS, ICILS, PISA, PIRLS beynəlxalq şagird qiymətləndirmələri və TALIS - Təlim və Tədris üzrə Beynəlxalq Araşdırma Tədqiqatı üzrə öyrənən və öyrədənlər üçün təlimlərin təşkili, pilot, sınaq və əsas mərhələlər mərkəzin əməkdaşları tərəfindən həyata keçirilir. Mərkəz tərəfindən tələbələr ölkəmizin qoşulduğu beynəlxalq qiymətləndirmələr haqqında məlumatlandırılır və bu sahədə müxtəlif fəaliyyətlərə cəlb olunurlar.

**- Son dövrlərdə bəzi ali məktəblərimiz nüfuzlu beynəlxalq reytinqlərdə yer alırlar. Bu yöndə daha da irəliləmək üçün, sizcə, hansı addımlar atılmalıdır?**

- Hər bir beynəlxalq reytinq qiymətləndirilməsinin özünəməxsus spesifik tələbləri və meyarları var. Bizim universitetlərimiz üçün beynəlxalq reytinqlərdə yer almaqla yanaşı, kompleks şəkildə özünü inkişaf etdirmək, dünyanın qabaqcıl tədqiqat-innovasiya universitetləri arasında özünə yer tutmaq, Azərbaycan elm və təhsilini dünya miqyasına çıxarmaq ən ümdə vəzifə olmalıdır. Bunun üçün ilkin mərhələdə bütün ali təhsil ocaqlarımız institusional və proqram akkreditasiyalarından keçməli və özünün təsdiq olunmuş Strateji İnkişaf Planı əsasında öz hədəflərinə doğru irəliləməlidir.

Bu sırada ən mühüm meyarlardan biri kimi, professor-müəllim heyətinin tədqiqatlarının nəticələrinin beynəlxalq elmmetrik bazalarda indekslənən nüfuzlu jurnallarda dərc olunmasını təmin etmək, bunun üçün müəyyən təşkilati-texniki və stimullaşdırıcı tədbirlər görmək olar. Burada yanaşmalar müxtəlifdir. Məsələn, bu məqsədlə Pedaqoji Universitetdə, onun bütün filialları və kollecində professor-müəllim heyətinin reytinq qiymətləndirilməsi sistemi tətbiq olunur ki, burada aparılan tədqiqatlar, onların nəticələrinin nüfuzlu və impakt faktorlu jurnallarda dərcinə görə əməkdaşların əməkhaqqılarına stimullaşdırıcı əlavələr ödənilir. Biz inanırıq ki, yaxın illərdə Pedaqoji Universitet də profilinə uyğun olaraq beynəlxalq reytinqlərdə öz yerini tutacaqdır. Ümumiyyətlə, ölkə təhsil sistemində gedən sürətli inkişaf nəticəsində yaxın gələcəkdə ali təhsil ocaqlarımızın daha da inkişaf edəcəyi, ölkəmizdə dünyamiqyaslı fundamental tətbiqi və nəzəri tədqiqatların səviyyəsinin yüksələcəyi və Azərbaycanın təhsil sahəsində dünyada tanınan innovasiyalar ölkəsi kimi diqqəti cəlb edəcəyini demək olar. Bu gözləntilər təkcə bir istək və ya arzuya dayanmır, bu, Azərbaycanın 2030 hədəfləri arasında yer alan ölkəmizin milli inkişaf prioritetləridir.

**- Söhbətimizin sonunda islahatçı rektorun abituriyentlərin ixtisas seçimi ərəfəsində gənclərə tövsiyələrini eşitməyə ehtiyac duyuruq.**

- Mən hər şeydən əvvəl ixtisas seçimi edəcək hər bir abituriyentə demək istərdim ki, qoy bilsinlər ki, seçdikləri ixtisas həm onların, həm də daimi inkişafda olan ölkəmizin gələcəyinə bu və digər mənada təsir edir. Ona görə də, həqiqətən istədiyiniz, özünüzü gördüyünüz, bu sahədə cəmiyyətə fayda verəcəyinizə əmin olduğunuz ixtisasları seçim siyahınızda qeyd edin. Digər tərəfdən, qəbul olunacağınız ixtisasdan asılı olmayaraq, özünüzdə 3 məziyyəti inkişaf etdirməyə çalışın. Əgər vətənpərvərlik ruhunu, xarici dil bilikləri və yüksək rəqəmsal savadlılığı bir arada birləşdirə bilsəniz artıq uğur və müvəffəqiyyətə çata biləcəksiniz.

**- Maraqlı söhbətə görə təşəkkür edirik.**

**Müsahibəni apardı:**
**Taleh MİRZƏYEV**
**"Xalq qəzeti", 10 avqust 2024-cü il, səh.9, № 169 (30573)**

## ADPU-da SABAH qruplarında tədrisin təkmilləşdirilməsi ilə bağlı təlimlər keçirilib



Azərbaycan Respublikası Elm və Təhsil Nazirliyinin SABAH qrupları layihəsi çərçivəsində tədris planlarının təkmilləşdirilməsi məqsədilə Türkiyənin Çankaya Universitetinin professoru Buket Ağğoyunlu və Hacettepe Universitetinin dosenti Saleh Bardaqçı tərəfindən ADPU-da ekspert qrupu üçün təlimlər keçirilib. 2-5 iyul tarixlərində davam etmiş təlimlərin məqsədi ali təhsil kurikulumlarının hazırlanmasında yeni yanaşmalara, fənlərin və kreditlərin müəyyənləşdirilməsi prinsipləri, təlim nəticəsi – fənn – təlim metodları – qiymətləndirmə strategiyası əlaqələrinin əhəmiyyətinə diqqət çəkmək və ekspertlərin bu mövzularda praktiki bacarıqlarını inkişaf etdirməkdir.

## ADPU-nun prorektoru BİTEKSEK-2024-də Azərbaycan təhsilində innovasiyalar və transformasiyalarla bağlı təqdimat edib



25-28 iyun tarixlərində Bakı şəhərində II Elm, Texnologiya, Mədəniyyət, İncəsənət, İdman və Təhsil Konqresi (BİTEKSEK-2024) keçirilib. Fənlərarası konqres Türkiyənin Qars Qafqaz Universiteti, Dram Təhsilverənləri Dərnəyi, Azərbaycan Dövlət Pedaqoji Universiteti və Bakı Xoreoqrafiya Akademiyasının birgə təşkilatçılığı ilə keçirilib.

Təhsil elmləri və təsviri sənətin bütün sahələrini əhatə edən konqres tədqiqatçılar, idarəçilər, müəllimlər, tələbələr, sənət adamları və təhsilə, sənətə bağlı bütün şəxsləri eyni platformada birləşdirərək təhsilin problemlərini elm işığında ortaya qoymaq, texnologiya, mədəniyyət və incəsənətlə bağlı problemləri müzakirə etmək, qiymətləndirmək və inkişaf üçün həllər təqdim etmək məqsədi daşıyır.

Konqres çərçivəsində Pedaqoji Universitetin strateji inkişaf məsələləri üzrə prorektoru Könül Pirverdiyeva "Azerbaycan Eğitim Sisteminde Reformlar: Yenilikler ve Dönüşümler" ("Azərbaycan təhsil sistemində islahatlar: innovasiyalar və transformasiyalar") mövzusunda təqdimatla çıxış edib. Təqdimatda Azərbaycan təhsil sistemində həyata keçirilən islahatlar və onların gələcək təhsil nailiyyətlərinə təsiri vurğulanıb. Azərbaycanın təhsil sahəsində apardığı struktur dəyişikliklərinin şagird nailiyyətlərinin artırılması, təhsilin keyfiyyətinin yüksəldilməsi və ümumilikdə təhsil sisteminin daha səmərəli olmasına töhfələrindən ətraflı bəhs edilib. İslahatların təhsil siyasəti, kurikulum dəyişiklikləri, müəllim hazırlığı və texnoloji infrastruktur kimi müxtəlif istiqamətləri hərtərəfli araşdırılıb.

Təqdimatdan sonra Azərbaycan Respublikası, Türkiyə Respublikası və Şimali Kipr Türk Respublikasının təhsil sistemlərinə dair panel müzakirəsi keçirilib. Panel müxtəlif təhsil sistemlərini müqayisə etmək, yaxşı təcrübələri bölüşmək və ümumi problemlərin həllini müzakirə etmək üçün məhsuldar dialoq mühiti təmin edib.

Paneldə təhsil sahəsində beynəlxalq əməkdaşlığın vacibliyi vurğulanıb və iştirakçılara təhsil sistemlərinin inkişafı və təkmilləşdirilməsi ilə bağlı yeni perspektivlər təqdim olunub.

## Humanitar Kollecin tələbələrinin ADPU-dakı təcrübələri uğurla başa çatıb



İyulun 4-də ADPU-nun Kitabxana-İnformasiya Mərkəzində Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universitetinin nəzdində Humanitar Kollecin "Kitabxana işi" ixtisası üzrə təhsil alan bir qrup tələbəsinin diplomqabağı təcrübəsinin başa çatması ilə əlaqədar tədbir keçirilib.

Tədbirdə çıxış edən Kitabxana-İnformasiya Mərkəzinin direktoru Zinharə Həsənova bildirib ki, təcrübədə olan tələbələrə yüksəkixtisaslı, peşəkar müəllimlər rəhbərlik edib. Təcrübə müddətində tələbələrin kitabxananın bazasından, texniki sənədlər və imkanlardan istifadə etməsinə imkan yaradılıb, həmçinin tələbələr iş prosesi ilə yaxından tanış olaraq təcrübi biliklər əldə ediblər. Təcrübəçi tələbələr müəssisə rəhbərliyinin verdiyi tapşırıqları, eləcə də fənn müəllimləri və təcrübəyə rəhbərlik edən metodist müəllimlərin tapşırıqlarını müvəffəqiyyətlə yerinə yetiriblər. Daha sonra tələbələrin ifasında şeir nümunələri səsləndirilib. Sonda təcrübə müddətində fərqlənən tələbələrə "Təşəkkürnamə" verilib.

## Üsküdar Universitetinin rektoru ADPU-da olub



Universitetdə Türkiyənin Üsküdar Universitetinin nümayəndə heyəti ilə görüş keçirilib. Görüşdə Üsküdar Universitetinin rektoru professor Nazifə Güngör, Media və kommunikasiya şöbəsinin müdiri dosent Gül Əsra Atalay, ADPU-nun rektoru professor Cəfər Cəfərov və Beynəlxalq əlaqələr şöbəsinin müdiri Günay Məhərrəmova iştirak edib.

Görüşün məqsədi ADPU və Üsküdar Universiteti arasında mümkün əməkdaşlıq imkanlarının müzakirəsi olub. Eyni zamanda təhsil sahəsində əməkdaşlığın inkişaf etdirilməsi, tələbə və müəllim mübadiləsi, ortaq elmi tədqiqatların aparılması, konfrans və seminarların birgə təşkili, akademik proqramların uyğunlaşdırılması kimi məsələlər ətrafında fikir mübadiləsi aparılıb.

Professor Cəfər Cəfərov ADPU ilə Türkiyə universitetləri arasında mövcud olan əlaqələrin daha da möhkəmləndirilməsinin vacibliyini qeyd edib və bu istiqamətdə atılacaq addımları dəstəkləyəcəyini bildirib. O, həmçinin, hər iki universitetin akademik potensialından səmərəli istifadə etməklə təhsil keyfiyyətinin artırılmasının önəmini vurğulayıb. Üsküdar Universitetinin rektoru Nazifə Güngör də təmsil etdiyi universitet haqqında ətraflı məlumat verərək qurulacaq yeni əməkdaşlığın gələcəkdə daha da genişlənməsi üçün perspktivlərdən bəhs edib.

Yekunda qonaqlar universitetin tədris binası, yeni açılmış "Türk dili və ədəbiyyatı" ixtisasının tələbələri, Qərbi Azərbaycan Araşdırmalar Mərkəzi, Türksoy kafedrası, Türkoloji Mərkəz, Heydər Əliyev Mərkəzi və kitabxana ilə tanış olublar.

## 1983-cü ilin məzunları ADPU-da görüşdülər



İyunun 28-də ADPU-nun Pedaqoji (indiki İbtidai təhsil) fakültəsinin 1983-cü il məzunlarının görüşü keçirilib. 41 ildən sonra doğma universitetdə görüşən məzunlar əvvəlcə Ümummilli Lider Heydər Əliyevin abidəsi önünə tər çiçəklər qoyaraq Ulu Öndərin xatirəsini ehtiramla anmışlar.

Sonra rektor professor Cəfər Cəfərov tədbir iştirakçılarına universitetdə həyata keçirilən yeniliklər haqqında məlumat verib.

H.Əliyev məktəbinin lektoriyasında universitetin Məzun koordinasiya və karyera şöbəsinin müdiri Könül Əsgərovanın moderatorluğu ilə davam edən tədbirdə çıxış edən tədris işləri üzrə prorektor dosent Eldar Aslanov 103 illik tarixi olan Pedaqoji Universitetin respublikamızda gənc nəslin təlim, təhsil və tərbiyəsindəki mühüm roluna diqqət çəkib. Çıxış edənlərdən Tədris departamentinin direktoru dos. Sənan Əliyev, İbtidai təhsil fakültəsinin dekanı prof. Qızxanım Qəhrəmanova, məzunlardan Hüseyn Hacıyev, Hacif Təhməzov, Mehriban Həsənova, Şahnaz İsmayılova da öz təəssüratlarını bölüşüblər.

## Biruni Universiteti ilə əməkdaşlığın detalları müzakirə olunub



ADPU-da Türkiyənin Biruni Universitetinin nümayəndəsi ilə görüş keçirilib.

Biruni Universitetinin rektor müşaviri dosent Burak Önal, ADPU-nun tədris işləri üzrə prorektoru dosent Eldar Aslanov və Beynəlxalq əlaqələr şöbəsinin müdiri Günay Məhərrəmovanın iştirak etdiyi görüşdə Pedaqoji Universitet və Biruni Universiteti arasında gələcək əməkdaşlığın detalları müzakirə olunub. Eyni zamanda tələbə və müəllim mübadiləsi, ortaq elmi tədqiqatların aparılması, konfrans və seminarların birgə təşkili, akademik proqramların uyğunlaşdırılması kimi məsələlər ətrafında fikir mübadiləsi aparılıb.

Biruni Universitetinin nümayəndəsi dos. Burak Önal təmsil etdiyi universitet haqqında ətraflı məlumat verərək qurulacaq yeni əməkdaşlığın gələcəkdə daha da genişləndirilməsi üçün potensialın olduğunu bildirib.

Yekunda qonaq universitetin tədris binası, yeni açılmış "Türk dili və ədəbiyyatı" ixtisasının tələbələri, Qərbi Azərbaycan Araşdırmalar Mərkəzi, Türksoy kafedrası, Türkoloji Mərkəz, Heydər Əliyev Mərkəzi və Kitabxana-İnformasiya Mərkəzi ilə tanış olub.

# ADPU-nun Kitabxana-İnformasiya Mərkəzi mühüm maarifləndirmə və mədəni mərkəz rolunu oynayır

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Kitabxana-İnformasiya Mərkəzi 2024-cü ilin ilk altı ayında aktiv fəaliyyət göstərib.

740.959 nüsxə ümumi fonda malik ölkəmizin ən böyük ikinci universitet kitabxanası olan ADPU-nun Kitabxana-İnformasiya Mərkəzinin e-kataloqundakı kitabların sayı ilin ilk 6 ayında 13.810 adda 84.255 nüsxə kitaba çatdırılıb. Bunlardan 68.140 nüsxəsi latın qrafikası ilə Azərbaycan dilində, 1.826 nüsxəsi rus, 14.289 nüsxəsi isə digər xarici dillərdədir.

Belə ki, 2024-cü ilin birinci yarısında 9.646 nəfər oxucuya 22.146 nüsxə kitab verilişi həyata keçirilib, 14.514 nəfər istifadəçi e-kitabxananın xidmətlərindən yararlanıb.

Eyni zamanda bu dövrdə 9.316 sorğu cavablandırılıb. Qeyd edək ki, kitabxananın oxucularından 105 nəfəri universitetdənkənar oxucular olub. Oxuculardan 101 nəfəri fondda olan elmlər və fəlsəfə doktoru dissertasiyalarından, 57 nəfəri avtoreferatlardan istifadə, 275 nəfəri magistr dissertasiyalarından istifadə edib.

Həmçinin son 6 ay ərzində ADPU-nun Kitabxana-İnformasiya Mərkəzinin fonduna 917 nüsxə yeni nəşrlər daxil olub (725 nüsxə Azərbaycan dilində, 12 nüsxə rus dilində, 16 nüsxə digər xarici dillərdə, 13 nüsxə elmlər doktoru və fəlsəfə doktoru dissertasiyası, 44 nüsxə avtoreferat, 248 nüsxə proqram, 33 adda 78 nüsxə digər jurnallar olmaqla).



Bunlarla yanaşı Pedaqoji Universitetin Kitabxana-İnformasiya Mərkəzi müntəzəm olaraq mədəni-kütləvi tədbirlər icra edir, eləcə də mərkəz müxtəlif universitetdaxili və xarici önəmli tədbirlərin keçirildiyi cəlbedici məkan kimi diqqəti cəlb edir. Ümummilli Lider Heydər Əliyevin anadan olmasının 101-ci ildönümünə həsr olunmuş "Heydər Əliyev- 101" adlı sərgi, M.Ə.Rəsulzadənin 140 illiyinə həsr olunmuş kitab sərgisi, 14 Fevral – Beynəlxalq Kitab Bağışlama Gününə həsr olunmuş tədbir, ADMİU nəzdində Humanitar Kollecin "Kitabxana işi" ixtisasının tələbələrinin diplomqabağı təcrübəsinin təşkili, əlamətdar və tarixi günlərə dair 8 müxtəlif sərgi də bunlara misal ola bilər.

# "İnklüziv təhsil üçün davamlı peşəkar inkişaf" - təlim kursu keçirilib

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Beynəlxalq əlaqələr üzrə prorektorluğunun nəzdində Təlim-Tədris Mərkəzi tərəfindən "İnklüziv təhsil üçün davamlı peşəkar inkişaf" mövzusunda 36 saatlıq onlayn təlim kursu keçirilib. ADPU-nun baş müəllimi, pedaqogiya üzrə fəlsəfə doktoru Gülşən Eminova tərəfindən interaktiv formada keçirilən təlim kursunda müdavimlərə insan hüquqlarına əsaslanan inklüziv təhsil, əlilliyin sosial modeli, inklüziv sinif təcrübəsinin yaradılması: uşaqyönümlü pedaqogika, inklüziv siniflərdə müxtəlif təlim üsulları, təqdimat və çıxış etmək bacarıqlarının formalaşdırılması, bədən dili, inklüziv siniflərdə dərs planlaşdırılmasına verilən tələblər, inklüziv siniflərdə qiymətləndirmə metodları istiqamətlərində nəzəri və praktik biliklər verilib, müzakirələr aparılıb.




# Pedaqoji Universitetin tələbəsi "Ədibin Evi"ndə əski əlifba kursunu uğurla başa vurub

XX əsr milli ədəbi-bədii fikir tarixinin görkəmli nümayəndəsi, yazıçı, alim və pedaqoq Mir Cəlalın 1920-1940-cı illərdə İçərişəhərdə yaşadığı məkanda yaradılmış "Ədibin Evi" Ədəbiyyata Dəstək Fondu əski Azərbaycan əlifbasında yazılan ədəbiyyatımızın tədris və tədqiqi məqsədi ilə ilin əvvəlindən ilk dəfə olaraq Azərbaycanın müxtəlif ali təhsil ocaqlarının tələbələri üçün "Ədibin Evi"ndən qazandıqları təqaüdlə "Əski Azərbaycan Əlifbası" kursuna başlayıb. Kursun məqsədi əski əlifba ilə yazılmış əsərləri tədqiq etməyi bacaran peşəkar gənc mütəxəssislər yetişməkdir.

Fevral ayının 1-dən start götürən kursun ilk sinfi bu günlərdə keçirilən məzun törənində sertifikatla təltif olunublar. Qeyd edək ki, kursu uğurla başa vuraraq təltif olunan 10 tələbədən biri Pedaqoji Universitetin Tarix və coğrafiya fakültəsinin "Tarix və coğrafiya müəllimliyi" ixtisasının IV tədris ilinin tələbəsi Seyranə İbrahimovadır.

"Əski Azərbaycan Əlifbası" kursunun gələcəkdə də davam edəcəyini elan edən Fondun direktoru Şəfəq Mehrəliyeva nəzəri bilikləri möhkəmləndirmək məqsədi ilə ilk məzun sinfinin növbəti akademik semestr ərzində Azərbaycan Respublikasının Prezidentinin İşlər İdarəsinin İctimai-Siyasi Sənədlər Arxivinin bölmə müdiri, filologya üzrə fəlsəfə doktoru Şəhla Abdullayevanın rəhbərliyi ilə birgə transliterasiya layihəsi üzərinə çalışacağını elan edib.





# Tələbəmiz Tələbələrin Avropa Universitet Oyunlarında bürünc medal qazanıb



Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Məktəbəqədər təhsil fakültəsinin II tədris ilinin tələbəsi, ADPU Tələbə Həmkarlar İttifaqı Komitəsinin İdman Klubunun rəhbəri Fatimə Cəbrayılova iyulun 17-də Macarıstanın Mişkolts şəhərində keçirilən Tələbələrin Avropa Universiteti Oyunları çərçivəsində karate üzrə qadınların komanda yarışlarında Azərbaycanı təmsil edib. III yerə çıxan komandanın üzvləri Oyunların bürünc medalına layiq görülüblər.

# Elmi Şuranın iclası - Riyaziyyat fakültəsinə yeni dekan seçilib





İyulun 18-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Elmi Şurasının 2023/2024-cü tədris ili üçün sonuncu iclası keçirilib.

İclası giriş sözü ilə açan Elmi Şuranın sədri, Pedaqoji Universitetin rektoru, professor Cəfər Cəfərov iclası giriş sözü ilə açıb və ötən dövrdə elmi ad və dərəcələr almış əməkdaşlarlara müvafiq diplomları təqdim edib. Pedaqogika elmləri doktoru Nabat Cəfərovaya professor diplomu, tarix üzrə fəlsəfə doktoru Şəhla Qurbanova və kimya üzrə fəlsəfə doktoru Gülnarə Babayevaya dosent attestatı, kimya elmləri doktoru Kərim Quliyev və filologiya elmləri doktoru Ədalət Abasova elmlər doktoru diplomu, pedaqogika üzrə fəlsəfə doktoru Xatirə Qocayeva, filologiya üzrə fəlsəfə doktoru Elnarə Niftəliyeva və filologiya üzrə fəlsəfə doktoru Məhrux Dövlətzadəyə fəlsəfə doktoru diplomu təqdim olunub.

Daha sonra Tədris departamentinin direktoru, dosent Sənan Əliyev ADPU-da 2023/2024-cü tədris ilinin yaz imtahan sessiyasının nəticələri barədə, elm və innovasiyalar üzrə prorektor, professor Asəf Zamanov isə 2023/2024-cü tədris ili üzrə magistrantların dissertasiya işlərinin müdafiəsi və yaz imtahan sessiyasının yekunları barədə məruzə ediblər. Riyaziyyat fakültəsində dekan seçkisinin nəticələri barədə məruzə edən Tədris departamentinin direktoru, dosent Sənan Əliyev diqqətə çatdırıb ki, iyulun 8-də keçirilən seçkilərdə dosent Allahverdi Qədir oğlu Cəfərov fakültəyə yeni dekan seçilib.

Daha sonra cari məsələlər müzakirə olunub.

## ADPU SİM-in universitetin 2030-cu il üçün Strateji İnkişaf Planı ilə bağlı təklifləri müzakirə olunub



İyulun 29-da Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) "ADPU-2030 Strateji İnkişaf Planı" ilə bağlı ADPU-nun Strateji İnkişaf Mərkəzinin (ADPU SİM) hazırladığı təkliflərin müzakirəsi təşkil olunub.

ADPU-nun strateji inkişaf məsələləri üzrə prorektoru Könül Pirverdiyeva və Strateji İnkişaf Mərkəzinin təşkilatçılığı ilə həyata keçirilən görüşdə "ADPU-2030 Strateji İnkişaf Planı" layihəsinin işçi variantının ətraflı təhlili aparılıb, mümkün dəyişikliklər və təkmilləşdirmə məqsədi daşıyan təkliflər müzakirə edilib.

Pedaqoji Universitetin gələcək hədəflərini formalaşdıracaq mühüm məsələlər ətrafında fikir mübadiləsini və strateji prioritetlərin dəyərləndirilməsini hədəfləyən görüşdə Beynəlxalq Şagird Qiymətləndirmə Tədqiqatları hesabatlarının, UNESCO, Avropa İttifaqı, Dünya İqtisadi Forumu, Birləşmiş Millətlər Təşkilatı, Beynəlxalq Universitetlər Assosiasiyası kimi beynəlxalq qurum və təşkilatların təhsilin transformasiyası ilə bağlı qlobal çağırışları diqqətə çatdırılıb. Həmçinin rəqəmsal vətəndaşlıq, rəqəmsal savadlılıq, ekoloji maarifləndirmə, media savadlılığı kimi günümüz üçün vacib olan səriştələr və onların təhsilalanlarda formalaşdırılmasının, universitetin Strateji İnkişaf Planına inteqrasiyasının əhəmiyyəti vurğulanıb.



ADPU SİM tərəfindən Pedaqoji Universitet tələbələrinin texnoloji avadanlıqlardan və sosial mediadan istifadə vərdişlərinin ölçülməsi, onların bu vasitələrdən nə qədər və necə istifadə etdiyinin, rəqəmsal mühitdəki fəallıqlarının dəyərləndirilməsi məqsədilə sorğu həyata keçirilib. Sorğunun nəticələrinə müvafiq olaraq tələbələrin rəqəmsal texnologiyalardan ən yüksək səviyyədə yararlanmalarını, rəqəmsal mühitdə akademik və sosial həyatlarının dəstəklənməsini, onlara daha səmərəli rəqəmsal xidmətlərin göstərilməsini təmin etmək üçün SİM tərəfindən irəli sürülən təkliflər ətrafında fikir mübadiləsi təşkil olunub. Qeyd edək ki, hər bir öyrənən üçün bərabər, keyfiyyətli və əlçatan rəqəmsal təhsilin təmin olunması UNESCO-nun "Təhsildə Transformasiya" Sammitində səsləndirilən qlobal çağırışlardan biridir.

SİM əməkdaşları tərəfindən universitetin strateji hədəf və fəaliyyətlərinin dayanıqlı inkişafa töhfə verən tədqiqatların aparılması, cəmiyyətə faydalı sosial xidmətlərin göstərilməsi, tənqidi düşüncə, yaradıcılıq və etik dəyərləri təşviq edən öyrənmə mühitinin inkişaf etdirilməsi yönündə qurulmasına dair təkliflər irəli sürülüb, qeyd olunan məsələlərin "ADPU – 2030 Strateji İnkişaf Planı"nda əks etdirilməsinin əhəmiyyəti barədə danışılıb.

ADPU-nun rektoru, professor Cəfər Cəfərov təqdimat və təklifləri müsbət dəyərləndirib, müəyyən tövsiyələr verərək qeyd olunan məsələlərin Elmi Şurada yenidən təqdim olunmasının zəruri olduğunu vurğulayıb. "ADPU – 2030 Strateji İnkişaf Planı" layihəsinin işçi qrupunun sədri, tədris işləri üzrə prorektor, dos. Eldar Aslanov strateji hədəflərin yenilənməsi ilə universitetdə dövrün tələblərinə uyğun təkmilləşmiş innovativ öyrənmə və öyrətmə mühitinin inkişaf etdirilməsini qarşıya qoyulan əsas məqsəd kimi dəyərləndirib.

Məlumat üçün qeyd edək ki, ADPU-nun təsdiq olunmuş sonuncu Strateji İnkişaf Planı 2018-2023-cü illəri əhatə edib.

## Pedaqoji Universitet ali təhsil müəssisələrinin sərgisində iştirak edib



İyulun 31-də Dövlət İmtahan Mərkəzinin elektron imtahanlar korpusunda ali təhsil müəssisələrinin sərgisinin açılışı olub. Dövlət İmtahan Mərkəzinin aparat rəhbəri Vəfadar Misirov iştirakçıları salamlayaraq ali təhsil müəssisələrinə qəbul kampaniyası və ixtisas seçimi ərəfəsində abituriyentlərlə ali təhsil müəssisələri nümayəndələrinin birbaşa görüş fürsətinin əhəmiyyətini vurğulayıb və qonaqlara Dövlət İmtahan Mərkəzinin təşəbbüsünə qoşulduqları üçün təşəkkür edib.



Sərgidə ölkəmizdə fəaliyyət göstərən 40-a yaxın dövlət və özəl ali təhsil müəssisəsi, həmçinin müxtəlif qurumların – Dövlət İmtahan Mərkəzi, Elm və Təhsil Nazirliyi, Tələbə Təhsil Kredit Fondu, "Abituriyent" jurnalı redaksiyası və otk.az onlayn sınaq imtahanı portalının stendləri ilə yanaşı Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) stendi də yer alır.

31 iyul – 2 avqust 2024-cü il tarixlərində təşkil olunan sərgidə abituriyentlər və onların valideynləri Pedaqoji Universitetin stendində ADPU-nun nümayəndələri ilə birbaşa ünsiyyət quraraq ixtisaslar, tədris proqramları, maddi-texniki baza, təhsil haqqı, güzəştlər, təqaüd proqramları və digər məsələlərlə bağlı onları maraqlandıran suallara cavab alıblar..

Sərginin ilk günündən ADPU-nun stendinə xüsusi maraq göstərən abituriyentlərin ixtisas seçiminə dəstək göstərmək məqsədi ilə universitet əməkdaşları tərəfindən Pedaqoji Universitet haqqında ətraflı məlumatlar verilərək, ziyarətçilərə ADPU-dakı ixtisaslar, tədris infrastrukturu, tələbə həyatı, təqaüd və güzəşt imkanları, mübadilə proqramları və s.-lə bağlı informasiyaların əks olunduğu məlumatlandırıcı broşür və bukletlər təqdim edilib.

## ADPU tələbələri Azərbaycan filmlərini müzakirə edib: 5 kinonun sirri




Avqustun 2-də ADPU Təhsil Könüllüləri Tələbə Birliyinin (ADPU TKTB) təşkikatçılığı ilə 2 avqust - Azərbaycan Kinosi Günü münasibəti ilə "5 kinonun sirri" adlı onlayn görüş keçirilib.

Çıxış edən ADPU TKTB-nin sədri Səidə Abulova milli filmlərimizin Azərbaycan mədəniyyətinin önəmli inciləri olduğunu, ümumiyyətlə kino sənətinin milli mədəniyyətin inkişafında xüsusi yer tutduğunu diqqətə çatdırıb.

Azərbaycan filmləri haqqında məlumatlandırıcı təqdimatdan sonra seçilən beş filmdən – "Bəyin oğurlanması", "Bizim Cəbiş müəllim", "Uzaq sahillərdə", "Sehirli xalat" və "Bir qalanın sirri" filmlərindən səhnələr nümayiş etdirilərək iştrakçılar tərəfindən səhnənin hansı filmə aid olduğu müəyyənləşdirilib. Daha sonra həmin filmlər haqqında müzakirələr aparılıb.

Görüş tələbələr tərəfindən maraqla qarşılanıb.

## Rektor köməkçisi Üsküdar və Haliç universitetlərində olub







Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rektor köməkçisi, s.e.ü.f.d. Riyad Rüstəmli Pedaqoji Universitetlə qardaş Türkiyənin ali təhsil müəssisələri arasında qarşılıqlı əməkdaşlıq məsələlərini müzakirə etmək məqsədi ilə Türkiyə Respublikasına səfər edib.

Səfər çərçivəsində İstanbulda yerləşən Üsküdar Universitetinin rektoru, professor Nazifə Güngör və Haliç Universitetinin baş katibi Burak Başqan ilə keçirilən görüşlərdə ADPU-nun sözügedən ali təhsil müəssisələri ilə əməkdaşlıq imkanlarının möhkəmləndirilməsi və dərinləşdirilməsi istiqamətində müzakirələr edilib, eyni zamanda tələbə və müəllim mübadiləsi, ortaq elmi tədqiqatların aparılması, konfrans və seminarların təşkili, akademik proqramların uyğunlaşdırılması kimi məsələlər ətrafında fikir mübadiləsi aparılıb.

Görüşlər əsnasında Pedaqoji Universitetlə Üsküdar Universiteti arasında imzalanmış qarşılıqlı əməkdaşlığa dair Anlaşma Memorandumu təqdim edilib.

## Ümumi orta təhsil bazasında Pedaqoji Kollecin Azərbaycan bölməsi üzrə plan yerləri 100 faiz dolub




Azərbaycan Dövlət Pedaqoji Universitetinin nəzdində Azərbaycan Dövlət Pedaqoji Kollecində 2024/2025-ci tədris ili üzrə ümumi orta təhsil bazasından tələbə qəbulu üçün 500 plan yeri ayrılıb.

İxtisas seçiminin nəticələrinə əsasən kollecdə ümumi orta təhsil bazasında Azərbaycan bölməsi üzrə ayrılan 415 plan yeri 100 % dolub, rus bölməsi üzrə ayrılan 85 plan yerinə isə 49 nəfər qəbul olunub.

Beləliklə, ümumi orta təhsil bazasından tələbə qəbulunun birinci mərhələsinin nəticələrinə əsasən ADPK üzrə ayrılan 500 plan yerinə ümumilikdə 464 nəfər (92.80 %) qəbul olunmuş, yalnız rus bölməsi üzrə 36 boş yer qalmışdır (7.20 %).

## ADPU e-universitet sisteminin tətbiqini genişləndirir



Azərbaycan Dövlət Pedaqoji Universiteti yeni tədris ilindən başlayaraq tədris prosesində effektivliyi artırmaq və daha yüksək keyfiyyət təmin etmək, eləcə də rəqəmsal transformasiya prosesini genişləndirmək məqsədilə elektron universitet sisteminin (e-universitet) tətbiqini genişləndirməyə başlayacaq. Bu məqsədlə universitet tədrisin elektron idarə olunması üzrə yeni proqram təminatı əldə edib.

Proqram təminatı tədris prosesinin idarə olunması, monitorinqi, sənədləşdirilməsi, hesabatlılığın təmin olunması, təhsil məzmununun çatdırılması və nəzarət vasitələrini özündə birləşdirir.

Yeni tədris ilindən sistemdən səmərəli istifadəni təmin etmək məqsədilə 21 avqustdan etibarən universitetdə mütəxəssislər tərəfindən tütorlar üçün təlimlərə start verilib. Təlimlərdə yeni sistemdə qrupları və tələbələri əlavə etmək, məlumatları idarə etməklə bağlı əsas məqamlar izah edilir, həmçinin sistemin funksionallıqları və üstünlükləri barədə məlumat verilir.

Qeyd edək ki, Pedaqoji Universitet elektron universitet sisteminin tətbiq dairəsini genişləndirməklə təhsil prosesinin idarə edilməsində müasir texnologiyaların tətbiqini gücləndirməyi və tələbə-müəllim əlaqələrinin daha səmərəli təşkil edilməsini hədəfləyir. Görülən tədbirlərlə indiyədək mövcud e-universitet xidmətlərini daha da təkmilləşdirmək nəzərdə tutulur.

## Professor Mahirə Hüseynova Beynəlxalq Elmlər Akademiyasının akademiki seçilib

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) beynəlxalq əlaqələr üzrə prorektoru, professor Mahirə Hüseynova Beynəlxalq Elmlər Akademiyasının akademiki seçilib.

"COP29: Müasir sivilizasiyanın aktual problemlərinin həllində dünya alimlərinin rolunun gücləndirilməsi. Ətraf mühitin mühafizəsi və yaşıl gündəm" mövzusunda keçirilən simpoziumda akademiklik diplomu prof. Mahirə Hüseynovaya təqdim olunub.

Qeyd edək ki, Beynəlxalq Elmlər Akademiyasının Azərbaycan bölməsinin prezidenti, prof. Elçin Xəlilovun açılış nitqi ilə çıxış etdiyi simpoziumda görkəmli elm adamları və ictimai xadimlər də iştirak ediblər.



## 600-dən yüksək bal toplayan və beynəlxalq idman yarışlarının mükafatçıları olan tələbələr ADPU-nu seçib



2024/2025-ci tədris ili üçün ali təhsil müəssisələrinə bakalavriat səviyyəsində tələbə qəbulunun ilkin nəticələrinə görə Pedaqoji Universitetdə 2655 mövcud plan yerindən 2626-sı (99 faiz) dolub. Tələbələrin 59,06 faizi dövlət sifarişi əsasında (1551 nəfər), 40,94 faizi isə ödənişli əsaslarla (1075 nəfər) ADPU-ya qəbul olunub.

Qəbul olunanların 48 faizi 400 baldan (1252 nəfər, ötən il 981 nəfər), 12 faizi isə 500 baldan (314 nəfər, ötənilki göstərici 79 nəfər) yüksək nəticə göstərən abituriyentlərdir. 13 nəfər xanım abituriyent isə 600 baldan yüksək nəticə ilə ADPU-nu seçiblər. Onlardan 4-ü universitetin Riyaziyyat və informatika müəllimliyi ixtisasına, 2-si Riyaziyyat müəllimliyi, 1-i Azərbaycan dili və ədəbiyyatı müəllimliyi, 1-i isə Xarici dil müəllimliyi ixtisasına qəbul olunub, 5 nəfəri isə Pedaqoji Universitetin filiallarını seçiblər.

O, cümlədən, ADPU-ya ən yüksək balla qəbul olunan tələbə 663.9 balla Riyaziyyat və informatika müəllimliyi ixtisasını seçən Fatimə Fuad qızı Nəcəfzadədir. Həmçinin, bu il 6 nəfər olimpiya və beynəlxalq idman yarışlarının mükafatçıları müsabiqədənkənar qaydada Pedaqoji Universitetin Fiziki tərbiyə və çağırışaqədərki hazırlıq müəllimliyi ixtisasına qəbul olunublar. Bu il Pedaqoji Universitet və filiallarında 13 ixtisas üzrə dövlət sifarişli yerlərdə 500-dən yüksək keçid balı formalaşıb. Universitet üzrə dövlət sifarişli yerlərdə ən yüksək keçid balı isə ADPU-nun Quba filialının Azərbaycan dili və ədəbiyyatı müəllimliyi ixtisası üzrə 606.9 baldır.

Qeyd edək ki, 2024/2025-ci tədris ili üçün ADPU-nun ixtisasları üzrə orta qəbul balı 382.63 bal təşkil edir.

## Doktoranturaya qəbul üzrə fəlsəfə imtahanı keçirilib

Sentyabrın 2-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) 2024-cü il üçün fəlsəfə doktorluğu proqramı üzrə



doktoranturaya qəbulun fəlsəfə fənni üzrə imtahanlarına start verilib.

İmtahan komisiyasının sədri, ADPU-nun elm və innovasiyalar üzrə prorektoru, professor Asəf Zamanov imtahan barədə məlumat verərək qeyd edib ki, Pedaqoji Universitetdə təşkil olunan imtahanlarda 2024-cü il üçün fəlsəfə doktorluğu proqramı üzrə doktoranturaya qəbul planına uyğun olaraq 15 müxtəlif elm və ali təhsil müəssəsindən 180 nəfərədək namizəd iştirak edib. İmtahanların gedişini izləyən ADPU-nun rektoru, prof. Cəfər Cəfərov namizədlərə uğurlar arzulayıb, onlara öz tövsiyələrini verib. Qeyd edək ki, Pedaqoji Universitet ölkə üzrə dokoranturaya qəbul üzrə fəlsəfə fənnindən qəbul imtahanlarının keçirildiyi 5 ali təhsil müəssisəsindən biridir.

İmtahanlarda Dövlət İmtahan Mərkəzi (DİM) tərəfindən keçirilən xarici dil imtahanından keçid balını toplayanlar, eyni zamanda, DİM tərəfindən beynəlxalq dil sertifikatı təsdiqlənmiş namizədlər iştirak ediblər.

## ADPU ilə Təhsilin İnkişafı Fondu arasında vahid tələbə kartı ilə bağlı ilk müqavilə imzalandı



Sentyabrın 4-də "TələbəPlus" layihəsi çərçivəsində Azərbaycan Dövlət Pedaqoji Universiteti (ADPU) ilə Təhsilin İnkişafı Fondu (TİF) arasında əməkdaşlıq müqaviləsi imzalanıb. İmzalanma mərasimində ADPU-nun və TİF-nin rəhbərliyi, Kapital Bankın nümayəndələri, eləcə də universitetin aktiv tələbələri iştirak ediblər. Təhsilin İnkişafı Fondunun Kapital Bank və "Visa" beynəlxalq ödəmə texnologiyaları şirkəti ilə əməkdaşlığı çərçivəsində həyata keçirilən layihə vahid tələbə kartlarının tətbiq edilməsini nəzərdə tutur. Açılış nitqi ilə çıxış edən Pedaqoji Universitetin rektoru, professor Cəfər Cəfərov vahid tələbə kartı yanaşmasının müsbət tərəflərindən bəhs edərək, layihə üzrə ilk olaraq ADPU ilə müqavilə imzalanmasını yüksək qiymətləndirib və tələbələr üçün olduqca faydalı olacaq bu təşəbbüs üçün Fonda minnətdarlığını bildirib. Qeyd olunub ki, yeni tədris ilindən tələbələrin istifadəsinə veriləcək bu kartların giriş-çıxış, debet, ödəniş kartı kimi istifadədən əlavə, endirim, güzəşt və keşbek imkanları təklif edəcək. Çıxış edən Təhsilin İnkişafı Fondunun İdarə Heyətinin sədri Elnur Nəsibov vurğulayıb ki, layihə bütün ölkə üzrə tələbələrin eyni güzəşt və endirimlərdən yararlanmalarını təmin etmək, eyni zamanda onların sosial həyatlarına dəstək göstərmək məqsədi daşıyır. Alış-veriş mərkəzlərində və tələbələrin ən çox istifadə etdiyi müxtəlif iaşə obyektlərində tələbələrə özəl güzəştlər edilməsi üçün TİF öz tərəfdaşları ilə birlikdə 200-dən artıq şirkətlə razılaşma əldə edib. Bundan əlavə, Mədəniyyət Nazirliyi ilə əldə olunan ilkin razılaşmaya əsasən, muzeylər, qalereyalar və sərgi salonlarında tələbələr üçün xüsusi güzəştlər nəzərdə tutulur. Layihə çərçivəsində ilkin olaraq 150 min tələbə kartının istifadəyə verilməsi planlaşdırılır.

# Yüksək nəticə - uğurlu seçim

Onlar Azərbaycan Dövlət Pedaqoji Universitetində müəllim ixtisası üzrə təhsil alırlar

Heç kimə sirr deyildir ki, ölkənin təhsil sistemində aparılan davamlı islahatlar, dövlətin təhsil sisteminə olan diqqət və qayğısı nəticəsində müəllimlik peşəsinə maraq son illərdə daha da artmaqdadır. İşə qəbul prosesinin şəffaflaşdırılması, müəllimlərin sosial rifah halının yaxşılaşdırılması məqsədilə həyata keçirilən tədbirlər gənclərin bu peşəyə üz tutmasında vacib rol oynayır. Ali təhsil müəssisələrinə qəbul imtahanlarında yüksək nəticə göstərən abituriyentlərin müəllimlik peşəsini ilk sıralarda qeyd etməsi artıq təəccüb doğurmur. 600-dən artıq bal toplayan çoxsaylı abituriyentin müəllimlik ixtisaslarını seçməsi son illərdə ənənəyə çevrilib. Ölkəmizin peşəkar müəllim kadrlarının hazırlanması üzrə ixtisaslaşmış əsas ali məktəb olan Azərbaycan Dövlət Pedaqoji Universiteti (ADPU) də hər il olduğu kimi, bu il də yüksək bal yığan abituriyentlərin seçim zamanı üstünlük verdikləri universitetlərdəndir. Nümunə üçün qeyd edə bilərik ki, 2024-2025-ci tədris ilinin bakalavriat səviyyəsinə qəbulun nəticələrinə əsasən, ayrılan 2655 plan yeri üzrə universitetə qəbul olunmuş tələbələrin 48%-i 400 12%-i isə 500 baldan yuxarı nəticə göstərənlərdir. 600-dən yuxarı bal toplayan 13 nəfər ADPU-ya qəbul olunub. Onlardan 5 nəfəri ADPU-nun filiallarını seçib. 8 nəfər isə universitetin müxtəlif fakültələrinə təhsil alır.




Fatimə Nəcəfzadə Sumqayıt şəhər Yusif Məmmədəliyev adına 31 nömrəli tam orta məktəbin məzunudur. Qəbul imtahanlarında 663.9 bal toplayaraq ADPU-nun "Riyaziyyat və informatika" müəllimliyi ixtisasını seçib. 2024-2025-ci tədris ili üçün Pedaqoji Universitetinə ən yüksək balla qəbul olunan tələbədir.

- Sevincliyəm, uğurlu nəticəyə çatdığım üçün özümü xoşbəxt hiss edirəm.

**- İstərdik, səni daha yaxından tanıyaq.**

- Mən Sumqayıt şəhərində anadan olmuşam. Elə orta təhsilimi də doğma şəhərdə almışam. Məktəb dövründən dünyada baş verən müasir proseslərlə yaxından maraqlanıram. Xüsusən də elm və texnologiyada baş verən sürətli dəyişikliklərə böyük marağım var. Elə bu marağıma görə Elm və Təhsil Nazirliyinin təşkil etdiyi "Sabahın alimləri" müsabiqəsində iştirak edərək II yerə sahib olmuşam. Həmçinin dil öyrənməyi çox sevirəm. Boş vaxtlarımda ingilis və yapon dillərini öyrənməyə çalışıram.

**- Qəbul imtahanlarında 663.9 bal yığmısan. Bu cür yüksək nəticə üçün hansısa xüsusi bir formulun varmı?**

- Bu nəticəni göstərmək üçün, məncə, məqsədli olmaq, vaxtı düzgün şəkildə bölüşdürməyi, idarə etməyi bacarmaq və çox keyfiyyətli çalışmaq lazımdır. Yəni çox oxumaqla yanaşı, necə oxumağı da bilmək vacibdir.

**- Belə yüksək nəticə ilə başqa ixtisasları da seçə və asanlıqla qəbul ola bilərdin. Niyə məhz müəllimliyə yönəldin?**

- Bu, məncə, ailədən gələn bir sevgidir. Mənim anam, bibim və xalam müəllimdir. Bu, məndə müəllimliyə xüsusi maraq oyadıb. Həm də bildiyim nələrisə başqasına öyrətməkdən zövq alıram. Bu səbəbdən də müəllim olmağa qərar verdim.

Mənim anam da illər əvvəl ADPU-nu bitirib. "Kimya və biologiya müəllimliyi" ixtisasının məzunudur. Anamdan universitet haqqında xoş xatirələr eşitmişəm. Fikrimə təsir edən digər amil ADPU-nun sırf müəllim hazırlığı üzrə ixtisaslaşmış olmasıdır. Düşünürəm ki, bu səbəbdən də tədris daha keyfiyyətlidir. Mənim həm riyaziyyata, həm də informatikaya böyük marağım var və burada hər iki ixtisasın sirlərinə yiyələnə biləcəyim də seçimimdə əsas rol oynadı.

**- Gələcəklə bağlı planın nədir?**

- Təbii ki, təhsilimi uğurla başa vurduqdan sonra gələcək karyeramı sevdiyim peşə olan müəllimlik peşəsində davam etdirəcəyəm. Öyrənəcəyim bilik və bacarıqları bu sahədə sevə-sevə tətbiq edəcəyəm.

**- Səncə, müəllim necə olmalıdır? Sən necə bir müəllim olmağı hədəfləmisən?**

- Məncə, yaxşı müəllim səbirli, anlayışlı, şagirdlərlə həm dost, həm sirdaş olmağı bacarmalıdır. Mən özüm də çalışacağam ki, bunları öz fəaliyyətimdə tətbiq edim.

**- Sənin kimi müəllim olmağı qarşısına məqsəd qoymuş şagirdlərə nə tövsiyə edərdin?**

- Bu peşənin ciddiliyini, məsuliyyətini dərk edib, sevərək seçəcəklərsə, bu yolda addımlamaqda məqsədləri qətidirsə əzmlə çalışsınlar və arzusunda olduqları ixtisası seçsinlər.




Aysu Qasımova Bakı şəhəri 295 nömrəli tam orta məktəbin məzunudur. Qəbul imtahanlarında 635.2 bal toplayaraq ADPU-nun "Azərbaycan dili və ədəbiyyat" müəllimliyi ixtisasına qəbul olunub. Əslən Ağsu rayonundan olan Aysu 2007-ci ildə anadan olub. Bir müddət sonra ailəsi ilə birgə Bakı şəhərinə köçüb, orta təhsilini Səttar Bəhlulzadə adına Xarici Dillər Təmayüllü Gimnaziyada alıb. Daha sonra təhsilini 295 nömrəli tam orta məktəbdə davam etdirib. 2023-2024-cü tədris ili üzrə Respublika Fənn Olimpiadalarının Azərbaycan dili və ədəbiyyat fənni üzrə bürünc medalçısıdır. Həmçinin orta məktəbi gümüş medalla bitirib. Hobbiləri müxtəlif janrlı kitablar oxumaq və dil öyrənməkdir. Yüksək nəticə əldə etməsinin sirrini isə belə izah edir:

- Düzü, əvvəllər 600 bal yığmaq mənə xəyal kimi gəlirdi. Səbirlə, təmkinlə, yorulmadan çalışaraq buna nail ola bildim. Məndən uğurlu nəticə gözləyən ailəmi, müəllimlərimi, yaxınlarımı sevindirdim. Buna görə özümü çox xoşbəxt hiss edirəm.

Aysunun müəllimliyə yönəlmə səbəbi elə öz müəllimləridir. Daha da dəqiq desək, müəllimlərindən gördüyü dəstək, güvən və ona öz övladları kimi yanaşmaları həmsöhbətimizə müəllimliyə yönəlmək üçün ilham mənbəyi olub. Aysu gələcəkdə öz müəllimləri kimi şagirdlərin yoluna işıq tutaraq onların cəmiyyətdə düzgün mövqeyə çatmalarına kömək etmək istəyir.

**- Seçdiyin ixtisas üzrə bir çox universitetdə təhsil almaq şansın var idi. Niyə ilk yerdə ADPU-nu seçdin?**

- ADPU haqqında əvvəlcədən məlumatım var idi. Çox geniş araşdırma etmişdim. Bu nəticəyə gəldim ki, bu universitet müəllimliyin ocağı olduğu üçün burada tədris yüksək keyfiyyətlə aparılır. Bu səbəbdən də tərəddüd etmədən ilk sıraya ADPU-nu yazdım.

O, gələcəkdə karyerasını müəllimlik üzrə qurmağı planlaşdırır. Hesab edir ki, bir insana təhsil verərək, nələrisə öyrədərək onu yüksək pillələrə qaldırmaq qürurverici bir hissdir.

**- "Peşəkar müəllimin şagirdə yanaşması necə olmalıdır? " sualına cavabı isə belədir:**

- Mən düşünürəm ki, əsl müəllim şagirdlərinə sadəcə hansısa biliyi mənimsədən kəs deyil. Əsl müəllim səbir və qayğı ilə yanaşaraq onlara düzgün yol göstərən, cəmiyyətə layiqli şəxsiyyət olmağı, uğurlu karyera qurmağı öyrədən şəxsdir.




Gərgin və yorucu marafondan uğurla çıxmağı bacaran növbəti qəhrəmanımız Gülnur Rzayevadır.
Gülnur Rzayeva Masallı rayonundandır. 9 illik təhsilini rayonun Təkdam kənd məktəbində alıb. X və XI siniflərdə təhsilini Həsənli kənd tam orta məktəbində davam etdirib. Qəbul imtahanlarında 632.8 bal toplayaraq ADPU-nun "Riyaziyyat və informatika müəllimliyi" ixtisasını seçib.

- Ona bəslənilən ümidləri doğrultduğu üçün sevincli olan Gülnur belə yüksək nəticə əldə etməyi çətin hesab etmir.

- Məncə, 600 və daha artıq bal yığmaq çətin deyil. Çətin olan bu yolda əziyyət çəkməyi bacarmaqdır. Mənim bu cür nəticə göstərməyimin səbəbi məsuliyyətlə çalışmağım olub. Əlbəttə ki, düzgün plan qurub çalışan hər kəs yüksək nəticə göstərə bilər. müəllim şagirdlərə qarşı diqqətli, mehriban, qayğıkeş olmalıdır. Söhbətimizə yüksək balla tələbə adını qazanmış daha bir istedadlı gəncimiz Sehri Məmmədova ilə davam edirik.

Həmsöhbətimiz müəllim olacağına 1 il öncədən qərar verdiyini qeyd edir. Bu peşəyə marağının da hər mövzuda özünə nümunə saydığı atası sayəsində yarandığını deyir. O da atası kimi riyaziyyat müəllimi olmaq istəyir.

**- Gülnurun ADPU-nu seçməsinin xüsusi səbəbi var. O, seçimini belə izah edir:**

– Qeyd etdiyim kimi, atam da riyaziyyat müəllimidir. Pedaqoji Universitetin məzunudur. Mən də qarşıma riyaziyyat və informatika müəllimi olmağı məqsəd qoyduğum zaman həm ondan fikirlərini öyrəndim, həm də universitet haqqında internet resursları və sosial şəbəkələr üzərindən araşdırmalar apardım. Yekun nəticə olaraq, mən də ADPU-nu seçmək qərarına gəldim. İxtisas üzrə ən yaxşı tədrisi burada ala biləcəyimi düşünürəm.

**"Səncə, yaxşı müəllim olmaq üçün hansı xüsusiyyətlərə sahib olmaq lazımdır?",** – sualına cavabında əsl müəllimin fənni ilə şagirdlər arasında körpü olmağı bacarmalı olduğunu qeyd edir. O, hesab edir ki, şagirdin fənni hansı dərəcədə sevməsi, necə qavraması birbaşa müəllimə olan münasibətindən asılıdır. Əsl müəllim şagirdlərə qarşı diqqətli, mehriban, qayğıkeş olmalıdır.




Söhbətimizə yüksək balla tələbə adını qazanmış daha bir istedadlı gəncimiz Sehri Məmmədova ilə davam edirik.

Sehri Məmmədova 2007-ci ildə Sabirabad rayonunun Qaragüney kəndində anadan olub. Sabirabad rayonu İlqar Qasımov adına Qaragüney kənd tam orta məktəbin məzunudur. Orta məktəbi fərqlənmə attestatı ilə bitirib. Qəbul imtahanlarında 619.8 bal toplayaraq ADPU-nun "Riyaziyyat və informatika müəllimliyi" ixtisasını seçib.

Bizə yüksək nəticə əldə etməsinin sirlərindən danışan Sehri əvvəlki həmsöhbətlərimizdən fərqli olaraq hər kəsin yüksək bal yığa biləcəyi fikri ilə razı deyil.

– Əlbəttə, yüksək bal yığmaq olduqca çətindir. Yüksək iradə, dözüm və səbir tələb edir. Fikrimcə, heç bir uğurun xüsusi bir gizli formulu, düsturu yoxdur. Bütün uğurların bünövrəsində sadəcə çox çalışmaq durur. Bu nəticə üçün insanda bir çox xüsusiyyətin birləşməsi vacibdir.

Müəllimlik peşəsini seçdiyi üçün qürur duyduğunu bildirir. Sehrinin də Pedaqoji Universiteti seçməsinin özünəməxsus hekayəsi var:

– Müəllim olmaq öz arzum idi. Bacım da bu universitetin III kurs tələbəsidir. "Azərbaycan dili və ədəbiyyat müəllimliyi" ixtisasında təhsil alır. ADPU haqqında bacımdan eşitdiyim xoş sözlər seçimimdə həlledici rol oynayıb.




Nərmin Məmmədova 2007-ci ildə Ağdam rayonunda anadan olub. Ağdam rayonu Səfərli kənd tam orta məktəbin məzunudur. Məktəbdaxili bilik yarışlarında dəfələrlə qalib olub. Qəbul imtahanlarında 601.6 bal toplayaraq ADPU-nun "Xarici dil müəllimliyi (ingilis dili üzrə)" ixtisasını seçib.

Nərmin uğurunu daha çox müəllimlərindən və ailəsindən aldığı dəstəklə əlaqələndirir. O, inanır ki, hər kəs qarşısına məqsəd qoysa, bu nəticəyə çatmağı bacarar.

Həmsöhbətimiz qeyd edir ki, müəllimliyə böyük sevgisi olub. Hər zaman müəllimliyin qürur duyulacaq bir peşə olduğunu düşündüyü üçün seçim zamanı üstünlüyü bu peşəyə verdiyini qeyd edir.

O, Pedaqoji Universiteti geniş araşdırmalardan sonra seçdiyini bildirir.

Düzünü desəm, ADPU haqqında daha öncədən o qədər də çox məlumatım yox idi. İxtisas seçimi zamanı daha yaxşı araşdırdım və doğru qərarın ADPU olduğunu anladım.

**"Sizdən ilhamlanıb müəllim olmaq istəyəcək şagirdlərə, abituriyentlərə nələri məsləhət görərdin?", – sualını belə cavablandırır:**

– Bu sahəni seçmək istəyənlərə müəllimliyin nə qədər önəmli olduğunu vurğulayardım, çünki öyrənmək qədər öyrətmək də çətin və məsuliyyətlidir. Bu məsuliyyəti üzərlərinə götürüb, həqiqətən daşıya biləcəklərsə, bu istiqamətə yönəlsinlər.




Zərifə Muradova Qəbələ şəhər Şirvan Bulqədirov adına 5 nömrəli tam orta məktəbin məzunudur. Qəbul imtahanlarında 605.6 bal toplayaraq ADPU-nun "Riyaziyyat və informatika" müəllimliyi ixtisasını seçib:

– Mən 2008-ci ildə Qəbələ rayonunda anadan olmuşam. 2024-cü ildə 11-ci sinifdən fərqlənmə attestatı ilə məzun oldum və DİM-in keçirdiyi qəbul imtahanlarında yüksək bal toplamağı bacardım.

**– Məqsədin müəllim olmaq olub. Necə oldu ki, qarşına bu məqsədi qoydun?**

– Müəllim olmaq mənim uşaqlıq arzum olub. Bu həvəs məndə həm anamın müəllim olması, həm də müəllimlərimə olan sevgi ilə yaranıb. Öyrətməyi sevirəm, riyaziyyatı sevirəm. Elə buna görə də, bu ixtisası seçmişəm.

**– Bəs ADPU ilə tanışlığın haradandır?**

– Mənim anam da ADPU-nun məzunudur. Bu səbəbdən əvvəldən də universitet haqqında məlumatım, xoş təəssüratlarım var idi. Seçimim məhz Pedaqoji Universitet oldu.

**– Yəqin ki, ananın yolunu davam etdirəcəksən.**

– Bəli. Gələcək arzum və planım universitetdə vacib bilik və bacarıqlara yiyələndikdən sonra müəllim olaraq fəaliyyət göstərməkdir.




Növbəti yüksək bal toplamış həmsöhbətimiz Türkanə Pənahlıdır. Türkanə Pənahlı 8 iyul 2007-ci ildə Zərdab rayonunun Çallı kəndində anadan olub. Çallı kənd M.V.Lomonosov adına tam orta məktəbin məzunudur. Türkanə qəbul imtahanlarında 603.1 bal toplayaraq ADPU-nun "Riyaziyyat müəllimliyi" ixtisasına qəbul olunub:

– ADPU haqqında daha əvvəldən məlumatım var idi. Seçim ərəfəsində sosial şəbəkələrdən daha da ətraflı məlumat toplaya bildim. Beləcə sevdiyim universitetə çevrildi. ADPU, adından da göründüyü kimi, tam peşəkar pedaqoq yetişdirir. Mən də gələcəkdə pedaqoq kimi yetişmək, vətənimə layiqli bir müəllim olmaq istəyirəm.

Gələcək karyerası ilə bağlı suala cavabında Türkanə qarşısına yaxın və uzunmüddətli planlar qoyduğunu bildirir. Onun əsas yaxınmüddətli planı peşəkar səriştələrə sahib müəllim kimi formalaşmaq və karyerasını bu sahədə davam etdirməkdir. O, hesab edir ki, bütün uğurların və uğurlu şəxsiyyətlərin təməlində müəllimlik dayanır.




Sonuncu müsahibimiz olan Aynur Rəhimli qəbul imtahanlarında 609.3 bal toplayaraq müəllimlik ixtisasını seçib.

O, 2006-cı ildə Bakı şəhərində anadan olub. Bakı şəhər 85 nömrəli tam orta məktəbin məzunudur. Qəbul imtahanlarında yüksək bal yığaraq "Riyaziyyat müəllimliyi" ixtisasına qəbul olunub. Həm qəbul imtahanlarında yüksək nəticə göstərdiyi, həm də müəllimlik ixtisasına qəbul olunduğu üçün özünü çox sevincli hiss edir.

Aynur yüksək nəticəsinin sirrini sevərək çalışmaqda, məqsədli olmasında və çox oxumasında görür.

Aynurun müəllimliyə yönəlmə hekayəsi anasının arzusu ilə başlayıb:

– "Müəllim olmağa həvəs anamın məsləhəti ilə yaranıb. Anam hər zaman müəllim olmağımı arzulayıb. Mənim də uşaqlıqdan riyaziyyata marağım olub. Bu arzuları birləşdirib "Riyaziyyat müəllimliyi" ixtisasını seçdim".

ADPU-nu seçməyi ona ilk dəfə müəllimi məsləhət görüb. Daha sonra özü geniş araşdırma aparıb, müəllimliyin sirlərini öyrənmək üçün yaxşı seçim olduğu qənaətinə gəlib.

Karyerasını müəllim olaraq quracağını qeyd edən Aynur hesab edir ki, peşəkar müəllim uşaqları sevən, bildiklərini paylaşmağı bacaran, hər zaman öyrənməyi və öyrətməyi sevən və göstərdiyi sevgi ilə şagirdlərinin də sevgisini qazana bilındir.

Sonda Aynur abituriyentlərə ürək sözlərini də qeyd etdi:

"Onlara mübarizə aparmağı, öz üzərlərində çox çalışmağı, seçimlərindən əmin olmalarını məsləhət görərdim".

Söhbətləşdi:
**Məhəmməd İSRAYILZADƏ**
"Azərbaycan müəllimi" qəzeti, sentyabr 2024-cü il, № 34 (9092), səh. 6

# 600-dən yüksək balla Pedaqoji Universiteti seçənlər

Son illərdə təhsil sahəsində aparılan uğurlu islahatlar, müəllimlik peşəsinin daha da artan prestiji qəbul imtahanlarında yüksək bal toplamış abituriyentlərin ixtisas seçimi zamanı müəllimlik peşəsinə üstünlük vermələri üçün əlavə stimul yaradır.

Müəllim hazırlığı üzrə ixtisaslaşmış ali təhsil müəssisəsi olan Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) tədrisin məzmunu və keyfiyyətinin artırılması, tələbələrin zamanın və əmək bazarının tələblərinə uyğunlaşmış, yüksək peşəkar bacarıqlara malik kadr kimi yetişdirilməsi məqsədi ilə atılan məqsədyönlü addımların nəticəsində gələcəyin müəllimləri seçimlərindəmüəllimliyin beşiyi sayılan Pedaqoji Universitetə üstünlük verirlər. Təsadüfi deyil ki, bir neçə ildir qəbul imtanlarında yüksək nəticə göstərən abituriyentlərin ixtisas seçimi zamanı ADPU-ya üstünlük verməsi ənənəvi hal alıb. 2024/2025-ci tədris ili üçün ali təhsil müəssisələrinə bakalavriat səviyyəsində tələbə qəbulunun nəticələrinə əsasən, ümumilikdə 13 nəfər 600 baldan artıq nəticə göstərmiş abituriyent ADPU-ya qəbul olunub. Onlardan 8 nəfəri ADPU-nun müxtəlif fakültələrində, 5 nəfəri isə universitetin filiallarında təhsil alacaqlar.

Gəlin, həmin tələbələrlə yaxından tanış olaq:




**1.Nəcəfzadə Fatimə Fuad qızı** Sumqayıt şəhəri Yusif Məmmədəliyev adına 31 nömrəli tam orta məktəbin məzunudur. Qəbul imtahanlarında 663.9 bal toplayaraq ADPU-nun Riyaziyyat və informatika müəllimliyi ixtisasını seçib. Fatimə 2024/2025-ci tədris ili üçün Pedaqoji Universitetə ən yüksək balla qəbul olunan tələbədir.

**2.Qasımova Aysu Vaqif qızı** Bakı şəhəri 295 nömrəli tam orta məktəbin məzunudur. Qəbul imtahanlarında 635.2 bal toplayaraq ADPU-nun Azərbaycan dili və ədəbiyyatı müəllimliyi ixtisasını seçib.

**3.Rzayeva Gülnur Elşən qızı** Masallı rayonu Təkdam kənd tam orta məktəbinin məzunudur. Qəbul imtahanlarında 632.8 bal toplayaraq ADPU-nun Riyaziyyat və informatika müəllimliyi ixtisasını seçib.

**4.Məmmədova Sehri Seymur qızı** Sabirabad rayonu İlqar Qasımov adına Qaragüney kənd tam orta məktəbinin məzunudur. Qəbul imtahanlarında 619.8 bal toplayaraq ADPU-nun Riyaziyyat və informatika müəllimliyi ixtisasını seçib.

**5.Rəhimli Aynur Soltan qızı** Bakı şəhəri 85 nömrəli tam orta məktəbin məzunudur. Qəbul imtahanlarında 609.3 bal toplayaraq ADPU-nun Riyaziyyat müəllimliyi (tədris ingilis dilində) ixtisasını seçib.

**6.Muradova Zərifə Murad qızı** Qəbələ şəhər Şirvan Bulqədirov adına tam orta məktəbin məzunudur. Qəbul imtahanlarında 605.6 bal toplayaraq ADPU-nun Riyaziyyat və informatika müəllimliyi ixtisasını seçib.

**7.Pənahlı Türkanə Rəşad qızı** Zərdab rayon Çallı kənd M.V.Lomonosov adına tam orta məktəbin məzunudur. Qəbul imtahanlarında 603.1 bal toplayaraq ADPU-nun Riyaziyyat müəllimliyi (tədris ingilis dilində) ixtisasını seçib.

**8.Məmmədova Nərmin Nadir qızı** Ağdam rayonu Səfərli kənd tam orta məktəbinin məzunudur. Qəbul imtahanlarında 601.6 bal toplayaraq ADPU-nun Xarici dil müəllimliyi (ingilis dili üzrə) ixtisasını seçib.

9.Qəbul imtahanlarında 655,8 bal toplayan **Nəsirli Mədinə Arif qızı** ADPU-nun Cəlilabad filialının Azərbaycan dili və ədəbiyyatı müəllimliyi ixtisasını seçib. O, Cəlilabad şəhər 3 nömrəli tam orta məktəbin məzunudur.

10. Qəbul imtahanlarında 639,9 bal toplayan **Həmidova Mədinə Asim qızı** isə Pedaqoji Universitetin Şamaxı filialını seçib. Orta məktəbi fərqlənmə diplomu ilə bitirən Mədinə təhsilini filialın Tarix müəllimliyi ixtisasında davam etdirəcək.

600 baldan yüksək nəticə göstərən daha iki abituriyent isə öz ixtisas seçimlərində ADPU-nun Quba filialını seçiblər.

11. 609,2 balla ADPU-nun Quba filialının Xarici dil müəllimliyi (ingilis dili üzrə) ixtisasını seçən **Novruzova Nəzrin Dəyanət qızı** Quba rayonu Aşağı Atuc kəndində dünyaya gəlib.

12. Qəbul imtahanlarında 606.9 bal toplayan **Eyyubova Həlimə Anar qızı** Quba filialının Azərbaycan dili və ədəbiyyatı müəllimliyi ixtisasında təhsil alacaq. Quba rayonu Hikmət Hüseynov adına 4 saylı tam orta məktəb və Quba rayonu Mehrab Niftəliyev adına texniki təmayüllü liseydə təhsil alıb.

13. Qəbul imtahanlarında 602.2 bal toplayan **Həsənli Gülgün Arzu qızının** seçimi isə ADPU-nun Ağcabədi filialıdır. O, filialın Riyaziyyat və informatika müəllimliyi ixtisasında təhsil alacaq. Ağdam rayonu 45 nömrəli tam orta məktəb və Laçın rayonu 23 nömrəli tam orta məktəbdə təhsil alıb.

# Beynəlxalq yarışların qalibləri ADPU-ya qəbul olunublar

2024/2025-ci tədris ili üçün ali təhsil müəssisələrinə qəbul imtahanlarının nəticələrinə əsasən ölkəmizi dünya müstəvisində uğurla təmsil etmiş 6 nəfər olimpiya və beynəlxalq idman yarışlarının mükafatçıları müsabiqədənkənar qaydada Pedaqoji Universitetin Fiziki tərbiyə və çağırışaqədərki hazırlıq müəllimliyi ixtisasına qəbul olunublar.

Gəlin, bu tələbələri yaxından tanıyaq:

**Kərimova Leyla Kərim qızı** – Sumqayıt şəhərində anadan olub. 2018-ci ildən pauerliftinq idman növü ilə məşğul olmağa başlayıb. 2 dəfə Respublika çempionu olub. 2021-ci ildə Gürcüstanda keçirilən dünya çempionatında qızıl medal qazanıb.

Leyla 2022-ci ildə Gürcüstanda keçirilən açıq Avropa çempionatında gənclər arasında 2 qızıl, böyüklər arasında 2 bürünc medal qazanmaqla yanaşı, gənclər arasında 74 kiloqram çəki dərəcəsində Avropa rekordu qırıb.

2023 cü ildə Birləşmiş Ərəb Əmirliklərində keçirilən dünya çempionatında gənclər arasında qızıl medal qazanıb. Eyni zamanda, öz çəki dərəcəsində Avropa rekordunu yeniləyib.

**Zəkiyev Rəsul Vahid oğlu** – Bakı Şəhərində anadan olub. O əlil arabasında rəqs və pauerliftinq idman növlərində ölkəmizi təmsil edir. Rəsul əlil arabasında rəqs üzrə ikiqat Azərbaycan çempionudur. 2019-cu ildə Rusiyada keçirilən dünya və qitə yarışlarında V yerə sahib olub. Həmin ildə Gürcüstanda keçirilən "IVERIA – DIAMOND – 2019" turnirində qızıl medal qazanıb. Para-pauerliftinq sahəsində 3 qat Azərbaycan çempionu olan Rəsul bu idman növündə də ölkəmizi uğurla təmsil etməkdədir. 2023-cü ildə Dubayda keçirilən para-pauerlifinq üzrə dünya çempionatında gənclərin yarışında 80 kq çəki dərəcəsində çıxış edən Rəsul həm ən yaxşı çəkiyə görə, həm də ümumi qaldırdığı çəkiyə görə rəqiblərindən üstün olaraq ölkəmizə 2 qızıl medal qazandırıb.

Əlavə edək ki, istedadlı gənc olan Rəsul idmanla yanaşı inklüziv "Əsa" teatrında aktyor olaraq çoxsaylı tamaşalarda rol da alıb.




**Dadaşova Zəhra İlqar qızı** – Sumqayıt şəhərində anada olub. 2009-cu ildən para-pauerliftinq idman növü ilə məşğul olmağa başlayıb. Zəhra 2021-ci ildə Azərbaycan çempionatının qalibi olub. Həmin ildə Gürcüstanda keçirilmiş dünya çempionatında ölkəmizi təmsil edərək bürünc medala sahib olub.

Z.Dadaşova 2022-ci ildə Tbilisi şəhərində para-paurrliftinq üzrə 50 kq çəki dərəcəsində həm gənclər arasında Açıq Avropa çempionatının, həm də regional Avropa çempionatının qalibi olaraq 2 qızıl medal qazanmağı bacarıb.

2023-cü ildə Tblisidə para-paureliftinq idman növü üzrə 55 kq çəki dərəcəsində mübarizə aparan Zəhra gənclər arasında fərdi çəkidə qızıl, ümumi çəkidə isə gümüş medal qazanıb. Həmin ildə Birləşmiş Ərəb Əmirliklərində keçirilən dünya çempionatında gənclərin yarışında həm fərdi, həm də ümumi çəkiyə görə rəqiblərini üstələyərək 2 qızıl medal qazanıb.

**İsmiyeva Xatirə Gülbala qızı** – Əslən Şamaxı rayonunun Ərəbşalbaş kəndindəndir. Görmə məhdudiyyətinə baxmayaraq, uşaqlıq yaşlarından idmana böyük marağı olan Xatirə cüdo idman növü ilə məşğul olmağa başlamış, bu yolda məqsədlərinə çatmaq üçün böyük əzm və qətiyyətlə mübarizə aparmışdır. X.İsmiyeva 2019-cu ildə İtaliyanın Genuya şəhərində keçirilən Avropa çempionatında B1, + 70 kq kateqoriyası üzrə ölkəmizi təmsil edib. O, 2022-ci ildə Bakıda keçirilən Avropa çempionatında (J1, + 70kq) 4-cü yer tutub. Həmin ildə Türkiyədə gözdən əlillər arasında paracüdo üzrə qran-pridə ("2022 IBSA Judo Grand Prix", J1, + 70 kq) gümüş medala sahib olub. Eyni zamanda İtaliyada keçirilən Avropa çempionatında bürünc medal qazanıb. 2023-cü ildə Niderlandda keçirilən Avropa Paralimpiya Çempionatında (J1, + 70 kq) Xatirə ölkəmizə bürünc medal qazandırıb. 2024-cü ildə paracüdo üzrə Antalya Qran-Prisində J1 kateqoriyası üzrə yarışda bürünc medal görüşündə məğlub olan idmançımız Paris-2024: Yay Paralimpiya Oyunlarında Azərbaycanı təmsil etmək hüququ qazanıb J1 kateqoriyası üzrə + 70 çəki dərəcəsində bürünc medal uğrunda görüşdə məğlub olub.

**Zeynalov Kamran Turab oğlu** – 1992-ci ildə Sabirabad rayonunda anadan olub. Paralimpiyaçı güllə atıcısı olan Kamran bir çox ölkədaxili və beynəlxalq yarışlarda mübarizə aparmaqdadır.

2010-cu ildə Xorvatiya, 2014-cü ildə Almaniya, 2018-ci ildə Cənubi Koreya və 2019-cu ildə Avstraliyada keçirilən dünya çempionatlarında ölkəmizi təmsil edib.

Kamran 2021-ci ildə Serbiyada keçirilən Qran-Pri turnirində 10 metr məsafəyə atəşaçma yarışında rəqiblərini qabaqlayaraq qızıl medal qazanıb.

K.Zeynalov Tokio-2020: Yay Paralimpiya Oyunlarında həm kişilərin fərdi yarışında, həm də komanda yarışında ölkəmizi təmsil edib. 2023-cü ildə pnevmatik tapançadan 10 metr məsafəyə atəşaçma üzrə Azərbaycan çempionatının qızıl medalçısıdır. Həmin ildə Almaniyada keçirilən beynəlxalq turnirdə tapançadan 50 metr məsafəyə atəşaçma üzrə kişilərin fərdi yarışında gümüş medal, komanda yarışında isə bürünc medal əldə edib. Miks komanda növü üzrə 10 metr məsafəyə yarışda da gümüş medal qazanan komandamızın heyətində yer alıb. 2023-cü ildə Peruda keçirilən Dünya çempionatında iştirak edən K.Zeynalov dünya çempionu olmağı bacarıb. Kamran Paris-2024: Yay Paralimpiya Oyunlarında ölkəmizi təmsil edib.

**Nəbiyev Əli Səhhət oğlu** – 1982-ci ildə Sumqayıt şəhərində anadan olub. 2000-ci ildə hərbi xidmət zamanı döyüş tapşırığını yerinə yetirərkən minaya düşüb. Bundan sonra kamandan oxatma idman növü ilə məşğul olmağa başlayan Əli həm ölkədaxili, həm də beynəlxalq yarışlarda mübarizəyə qoşulub. 2014-cü ildə Nəbiyev Çex Respublikasında beynəlxalq turnirdə komanda yarışında bürünc medalın sahibi olub. 2016-cı ildə stend atıcılığının kompakt-sportinq növü üzrə Azərbaycan turnirində bürünc medal qazanıb.

Ə.Nəbiyev 2018-ci ildə Çex Respublikasında keçirilən Avropa çempionatında və 2019-cu ildə İtaliyada keçirilən Avropa kubokunda ölkəmizi təmsil edib. 2020-ci il Azərbaycan çempionatında ölkə çempionu adını qazanıb.

2022-ci ildə Türkiyədə keçirilən V İslam Həmrəliyi Oyunlarında komanda yarışında bürünc medal qazanıb. 2023-cü ildə keçirilən Avropa Paralimpiya Çempionatında kamandan oxatma idman növü üzrə yığmamızın heyətində yer alıb. Həmin ildə keçirilən Heydər Əliyevin xatirəsinə həsr olunuş beynəlxalq turnirin qalibi olub.

## Quba filialında professor Yaşar Musayevin mühazirəsi: "Yaşıl enerji istehsalında problemlər və perspektivlər"





Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Quba filialında Almaniyada fəaliyyət göstərən Bakı-Nürnberq Mədəniyyət və Təhsil Mərkəzinin, Almaniya Azərbaycanlılarının Koordinasiya Şurasının İdarə Heyətinin sədri, "Şeffler" şirkətinin senior vitse-prezidenti, "Siemens Energy" şirkətində yaşıl texnologiyalar üzrə bölmə müdiri, texnika elmləri doktoru, professor Yaşar Musayev ilə görüş keçirilib.

Prezident İlham Əliyevin müvafiq Sərəncamı ilə 2024-cü ilin Azərbaycanda "Yaşıl dünya naminə həmrəylik ili" elan edilməsi və ölkəmizdə keçiriləcək COP-29 ilə əlaqədar "Yaşıl enerji istehsalında problemlər və perspektivlər" mövzusunda seminar-məruzə formatında keçirilən görüşdə filialın rəhbərliyi, professor-müəllim heyəti, tələbələr, yerli ictimaiyyətin təmsilçiləri, o cümlədən şəhid ailələrinin nümayəndələri və qazilər iştirak ediblər.

Əvvəlcə Ümummilli Lider Heydər Əliyevin və Azərbaycan Respublikasının ərazi bütövlüyü və suverenliyi uğrunda canlarını fəda edən qəhrəman övladlarımızın əziz xatirəsi bir dəqiqəlik sükutla yad edilib.

ADPU-nun Quba filialının müəllimi Kəmalə Bayramova professor Yaşar Musayevin bioqrafiyası ilə iştirakçıları tanış edəndən sonra məlumat verib ki, görüşün məqsədi Azərbaycanın ev sahibliyi etdiyi COP-29 (Tərəflərin Konfransı-29) barədə fikir və düşüncələrini çatdırmaqdır. Sonra Azərbaycan-Almaniya münasibətlərinin tarixi və bu gününə, eyni zamanda, Azərbaycan sevdalı alim, diaspor təşkilatçısı Yaşar Musayevə həsr olunmuş "Yaşar Musayev ömrünün həmişəyaşar təntənəsi" mövzusunda fotorolik efirdə nümayiş olunub.

Yaşar Musayevin elm və diaspor sahəsində göstərdiyi xidmətlərə görə hər zaman geniş ictimaiyyətin diqqətində olduğunu bildirən direktor Yusif Alıyev vurğulayıb ki, 2022-ci ildə Azərbaycan diasporunun inkişafında xidmətlərinə görə, Yaşar Musayevin "Azərbaycan Respublikası Prezidentinin fəxri diplomu" ilə təltif edilməsi görkəmli alimin əməyinə dövlətimiz tərəfindən verilən layiqli qiymətdir.

Azərbaycanın BMT-nin İqlim Dəyişikliyi üzrə Çərçivə Konvensiyasının Tərəflər Konfransının 29-cu sessiyasına ev sahibliyi etməsinin məram və məqsədlərindən danışan dosent Yusif Alıyev son illər dünyanın fikir və düşüncə mərkəzinə çevrilən Bakının bu tədbir sayəsində dünya ictimaiyyətinin diqqətini yenidən qlobal bir mövzuya çevirməyə nail olduğunu qeyd edib. Prof. Yaşar Musayev COP-29 tədbirinin qarşıya qoyduğu qlobal vəzifələr, yaşıl enerjinin bu günü, sabahı, eləcə də Avropadakı Azərbaycan diasporunun fəaliyyəti barədə çıxış edərək Azərbaycan dövlətinin uğurlu beynəlxalq əlaqələrindən danışıb.

Professorun çıxışından sonra geniş sual-savab sessiyasında Quba filialının professor-müəllim heyətinin mövzu ətrafında peşəkar yanaşma sərgiləməsi bir daha təsdiq etdi ki, qlobal istiləşmə, iqlim dəyişikliyi, beynəlxalq enerji böhranı kimi ümumbəşəri məsələr hazırda insan cəmiyyətini narahat edən ən ciddi problemlər sırasında yer alır. Azərbaycanın COP-29 tədbirinə ev sahibliyi etməklə bütün bu problemlərin qlobal məkanda kompleks həllinə töhfə verməyə çalışır.

Azərbaycanın COP-29 tədbirinə ev sahibliyi etməsini tarixi nailiyyət kimi dəyərləndirən alim əminliklə bildirib ki, ölkəmizin bundan əvvəl keçirdiyi dünya əhəmiyyətli tədbirlərdə qazanılan təcrübələrin bu konfransda tətbiqi beynəlxalq aləm tərəfindən böyük maraqla qarşılanacaq.

Çıxışında "Yaşıl hidrogen" prosesinin ümumdünya faydalılığına geniş yer ayıran professor Yaşar Musayev diqqətə çatdırıb ki, yaşıl enerji istehsalında iridium elementinin təkrar emalı onun təbiətə mənfi təsirinin qarşısının alınmasında mühüm və vacib əhəmiyyətli məsələdir.

Azərbaycan diaspor təşkilatlarının Avropanın ictimai ailəsində yeri və rolu mövzusunda fikir və mülahizələrini bölüşən alim qeyd edib ki, milli diasporçuluğun yaranması, formalaşması və təşəkkülü istiqamətində ulu öndər Heydər Əliyevin qarşımızda qoyduğu hədəflərə doğru getmək əsas prioritetimizdir. Prezident İlham Əliyev bu sahədə dinamizmə nail olmaq üçün daha mühüm hədəflər müəyyən edib.

Şəhid Miqdad Abduləlimovun anası Tünzalə Abduləlimova görüşə dəvət olunduğu üçün və dəyərli mülahizələrini bölüşdüyünə görkəmli alimə dərin təşəkkürünü ifadə edib. Şair Ramiz Qusarçaylı Anadolu türkcəsində yenicə çapdan çıxmış "Vətən poeması" kitabını professor Yaşar Musayevə hədiyyə edib, dəyərli fikir və mühakimələrinə görə minnətdarlığını çatdırıb.

"AQSİA"-nın üzvü olan Azərbaycan və Almaniya iqtisadiyyat nazirliyinin sertifikatlı "headhunter"i Sevda Quliyeva çıxış edərək prof. Musayevin uğur və nailiyyətləri, eləcə də öz fəaliyyəti barədə fikir və düşüncələrini bölüşüb. Təqdimatda insan resurslarının idarə olunması, karyera qurmaq kimi məsələlərdən bəhs olunub.

Sonda filial rəhbərliyi tərəfindən prof. Yaşar Musayevə "Fəxri Diplom" təqdim olunub və qonaqlar "Xatirə kitabı"na ürək sözləri yazıblar.

## Ölkə üzrə pedaqoji kadr hazırlığının 34 faizi ADPU-nun payına düşür – Elmi Şuranın iclası



Sentyabrın 10-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Elmi Şurasının 2024/2025-ci tədris ili üçün ilk iclası keçirilib.

Açılış nitqi ilə çıxış edən ADPU-nun rektoru professor Cəfər Cəfərov yeni tədris ili ərəfəsində qarşıda duran vəzifələr və perspektivlər haqqında danışaraq diqqətə çatdırıb ki, qarşıdan gələn tədris ilində Pedaqoji Universitetdə bir sıra yeni istiqamətlər üzrə intensiv işlər aparılacaq. Bunlara misal olaraq, tələbələrlə müntəzəm sorğuların davam etdirilməsi, xarici universitetlərlə yeni ikili diplom proqramları üzrə müqavilələrin imzalanması, beynəlxalq reytinqlərdə təmsil olunmaq üçün işin gücləndirilməsi, e-universitet sisteminin tətbiqinin genişləndirilməsi, ixtisaslar üzrə proqram akkreditasiyası, eləcə də "ADPU 2030" Strateji İnkişaf Planının qəbul olunmasını qeyd edə bilərik. Tədris işləri üzrə prorektor dosent Eldar Aslanov "ADPU-nun 2024/2025-ci tədris ilinə hazırlığının vəziyyəti barədə" geniş məruzə ilə çıxış edib. Məruzədə qeyd olunub ki, 2023/2024-cü tədris ilinin yaz imtahan sessiyasından sonra 54 fənn üzrə təşkil olunan Yay semestrində ümumilikdə 295 nəfər (keçən il 158 nəfər) tələbə iştirak edib.

2024-cü ildə Pedaqoji Universitetdən məzun olan 2317 bakalavrdan 812-si Azərbaycanda magistraturaya qəbul olunub, 71 nəfəri isə təkrar bakalavr, magistratura və doktorantura səviyyələri üzrə xaricdə təhsilə müraciət ediblər (ümumilikdə məzunların 38 faizi). Xaricdə təhsilə müraciət edən məzunlar, əsasən, Türkiyə, ABŞ, Kanada və müxtəlif Avropa ölkələrində təhsillərini davam edəcəklər. Hərbi xidmətə gedən 237 nəfər istisna olmaqla əmək bazarına çıxan məzunlardan 612 nəfəri MİQ imtahanlarında iştirak edərək uğur qazanıb, 142 nəfəri dövlət orqan və müəssisələrində, 308 nəfəri özəl təhsil müəssisə və şirkətlərində, 211 nəfəri isə qeyri-təhsil özəl sektor müəssisələrində əmək fəaliyyətinə başlayıb. Beləliklə, ötən tədris ilinin məzunlarının ilkin məlumatlara görə 1273 nəfərinin məşğulluğu təmin olunub.

Məruzədə 2024/2025-ci tədris ili üzrə tələbə qəbulunun nəticələri ilə bağlı qeyd olunub ki, qəbul planı bakalavriat səviyyəsi üzrə 99, magistratura səviyyəsi üzrə isə 100 faiz təşkil edib.

Vurğulanıb ki, cari ildə pedaqoji ixtisaslarda ölkə üzrə ümumi plan yerləri 595 nəfər azalsa da, ADPU üzrə plan yerlərinin sayı 85 nəfər artırılıb. Ümumilikdə, ölkə üzrə pedaqoji ixtisasların plan yerlərinin 34 faizi ADPU-nun (filiallarla birlikdə) payına düşür.

Bu il Pedaqoji Universitetə qəbul olunanların 80 faizi (2121 nəfər) 300-dən, 48 faizi isə (1252 nəfər) 400-dən, 12 faizi isə (314 nəfər) 500-dən yüksək bal toplayanlardır. Həmçinin qəbul olunanlar arasında 8 nəfəri 600 baldan yüksək nəticə göstərib, 6 nəfəri isə beynəlxalq idman uğurlarına görə müsabiqədənkənar qaydada ADPU-ya qəbul olunub.

ADPU-ya qəbul olunan tələbələrin 1551 nəfəri (59,06 %) dövlət sifarişi əsasında qəbul olunub, ödənişli əsaslarla qəbul olunanlardansa 166 nəfəri (6,3 %) isə təhsil haqqına güzəşt hüququndan istifadə ediblər. Beləliklə, ümumilikdə Pedaqoji Universitetə cari ildə qəbul olunan tələbələrin 65,4 faizi dövlət hesabına təhsil alacaq.

Ödənişli təhsil alacaq tələbələrdən 134 nəfəri (12,5 %) təhsil tələbə kreditinə müraciət edib.

Məruzədə, həmçinin qeyd olunub ki, 2024/2025-ci tədris ilində ADPU-da təhsil almaq üçün 42 nəfər əcnəbi vətəndaş müraciət edib və hazırda sənəd qəbulu davam edir.

Rektorun müşaviri Ümid Mehdiyevin "ADPU-nun 2024/2025-ci tədris ili üçün strukturunun və ştat vahidlərinin təsdiq edilməsi barədə" məruzəsində isə yeni tədris ilində Pedaqoji Universitetdə inzibati idarəetmə sahəsində səmərəliliyi artırmaq, insan resursları və sənəd dövriyyəsinin idarə olunmasında daha çevik yanaşmaları tətbiq etmək məqsədi ilə həyata keçirilən struktur islahatları haqqında məlumat verilib. Qeyd olunub ki, yeni tədris ilindən universitetin Ümumi şöbəsinin ləğv olunması, İnsan resursları şöbəsinin isə çevirilmə yolu ilə səlahiyyətləri artırılaraq İnsan resursları və kargüzarlıq şöbəsinə çevirilməsi nəzərdə tutulur. Sənəd dövriyyəsinin isə yeni yaranacaq şöbənin tərkibində fəaliyyət göstərəcək Kargüzarlıq bölməsi tərəfindən icra olunacağı diqqətə çatdırılıb. Eləcə də, universitetdə İnformatika müəllimliyi ixtisasının tələbələri üçün "Lütfi Zadə adına təqaüd"ün təsis olunması haqqında məsələ müzakirəyə çıxarılıb. Qeyd edək ki, bununla da ADPU-dakı adlı təqaüdlərin sayı 14-ə çatacaq.

Tədris departamentinin direktoru dosent Sənan Əliyev 2024/2025-ci tədris ili üçün proqnozlaşdırılmış dərs yükü və ADPU-nun Akademik Təqviminin, 2023/2024-cü tədris ilinin yaz semestrinin imtahan sessiyasının nəticələrinə əsasən adlı təqaüd alan namizədlərin siyahısının və "ADPU-da tələbələrin kurs işləri (layihələri) haqqında Qaydalar"ın təsdiq olunması haqqında təqdimat edib.

Elmi katib, r.ü.f.d. Nərminə Abdullayeva professor Asəf Zamanovun "Naxçıvanlı elmlər doktorları" adlı kitabının nəşrinə icazə verilməsi barədə arayış verib.

Yekunda müzakirə olunan məsələlər haqqında Şura tərəfindən müsbət qərarlar qəbul olunub. Həmçinin "ADPU 2030" Strateji İnkişaf Planı layihəsinin ictimai müzakirəyə çıxarılması barədə qərar verilib.

## ADPU-da "STEAMLAND"-in açılışı olub



Sentyabrın 11-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) 2021-ci ildən fəaliyyət göstərən STEAM Mərkəzinin nəzdində "STEAMLAND"-in açılışı olub.

Açılış tədbirində ADPU-nun rektoru professor Cəfər Cəfərov, tədris işləri üzrə prorektor dosent Eldar Aslanov, sosial və humanitar məsələlər üzrə prorektor professor Fikrət Rzayev, ümumi işlər üzrə prorektor Tural Cəlilov, rektorun müşaviri Ümid Mehdiyev, Kimya və biologiya fakültəsinin dekanı dosent Reyhan Ağayeva, Riyaziyyat fakültəsinin dekanı dosent Allahverdi Cəfərov, Tədbirlərin təşkili tələbələrlə iş şöbəsinin müdiri Turan Kərimli, kafedra müdirləri və fakültənin professor-müəllim heyəti iştirak edib.

Çıxış edən universitetin rektoru prof. Cəfər Cəfərov mərkəzin nəzdində bu yeni innovasiya məkanının açılışını ali təhsil ocağında təhsilin məzmun və keyfiyyətcə yaxşılaşdırılması yolunda əlamətdar hadisə kimi qiymətləndirib. Qeyd olunub ki, Pedaqoji Universitet olaraq müəllim hazırlığı sahəsində beynəlxalq trendlər daim izlənilir və innovativ yanaşmaların tətbiqi, tədrisin keyfiyyət təminatının daha da gücləndirilməsi istiqamətində ardıcıl iş aparılır.

Daha sonra çıxış edən Fizika fakültəsinin dekanı, STEAM Mərkəzinin müdiri dosent Arzu Daşdəmirov STEAM Mərkəzinin fəaliyyəti və görülmüş işlər haqqında ətraflı məlumat verib. Vurğulanıb ki, 3 il ərzində uğurlu işlərə imza atan mərkəz öz fəaliyyət dairəsini daha da genişləndirirərək artıq kafedra statusunda, yenilənmiş formada işini davam etdirir.

Qeyd edilib ki, ADPU-da 8 ixtisasda STEAM-1 və STEAM-2 fənnləri tədris olunur. STEAM Mərkəzində praktik bacarıqlar qazanan tələbələrdən ibarət komandalar 2024-cü ildə keçirilən "Robotex" müsabiqəsində I və II yeri tutublar.

## Pedaqoji Universitet yeni tələbələrini qarşıladı



Sentyabrın 16-da Azərbaycan Dövlət Pedaqoji Universtitendə (ADPU) 15 sentyabr - Bilik Günü və yeni tədris ilinin başlanması ilə bağlı tədbir keçirilib. Azərbaycan Respublikasının Dövlət Himninin ifa olunmasından sonra tədbiri giriş sözü ilə açan ADPU-nun rektoru professor Cəfər Cəfərov universitetə yeni qəbul olunmuş tələbələri salamlayaraq onlara uğurlar arzulayıb.

Rektor qeyd edib ki, 2024/2025-ci tədris ili üçün ali təhsil müəssisələrinin bakalavriat səviyyəsinə tələbə qəbulunun nəticələrinə əsasən Pedaqoji Universitetin qəbul planı 99 faiz dolub. Diqqətə çatdırılıb ki, ölkədə aparılan davamlı və məqsədyönlü təhsil islahatlarının nəticəsində gənclərin müəllimlik peşəsinə marağı ildən-ilə artmaqdadır. Yüksək bal toplayan tələbələrin ixtisas seçimi zamanı ADPU-nu seçməsinin ənənəvi hal aldığını vurğulayan prof. C.Cəfərov vurğulayıb ki, 2024/2025-ci tədris ili üzrə bakalavriat səviyyəsinə tələbə qəbulunun nəticələrinə əsasən 600-dən yuxarı bal toplayan 13 nəfər ADPU-ya qəbul olunub. Tələbələrə öz tövsiyyələrini verən rektor gəncləri yeniləşən dünyanın tələblərini nəzərə alaraq özlərini zamanın və əmək bazarının tələblərinə uyğun formada yetişdirməyə, tələbəlik illərini səmərəli dəyərləndirməyə, peşəkar kadr kimi formalaşmaları üçün vacib olan dil və rəqəmsal bacarıqlarını inkişaf etdirməyə çağırıb.

Daha sonra 600-dən çox bal toplayaraq Pedaqoji Universitetə qəbul olunmuş tələbələr öz təəssüratlarını bölüşərək yeni tədris ili münasibəti ilə tələbə yoldaşlarını və professor-müəllim heyətini təbrik ediblər. Müəllimlik peşəsini seçmə məqsədlərindən danışan tələbələr gələcəyin peşəkar və səriştəli müəllimləri kimi formalaşmaq üçün əzmlə çalışacaqlarını bildiriblər.

## Tələbə qəbulu dövründə ADPU-da 5356 vətəndaş müraciəti cavablandırılıb




2024/2025-ci tədris ili üçün ali təhsil müəssisələrinin bakalavriat və magistratura səviyyəsinə tələbə qəbulu kampaniyası dövründə Pedaqoji Universitetin müvafiq strukturları və tələbə təşkilatları tərəfindən abituriyent və tələbələrin, eləcə də ictimaiyyət və KİV nümayəndələrinin sorğularını operativ cavablandırmaq, xüsusən abituriyentlər və valideynlərin ixtisas seçimi, mövcud ixtisaslar, infrastruktur və naviqasiya məsələləri, yataqxana, onlayn qeydiyyat, təhsil tələbə kreditinə müraciət və s. məsələlərlə bağlı münaticələrinə çevik qaydada baxmaq və lazımi dəstək göstərmək məqsədi ilə son iki ay ərzində sistemli fəaliyyət icra olunub.

Belə ki, bu dövrdə Universitetin İctimaiyyətlə əlaqələr və marketinq şöbəsi tərəfindən rəsmi instaqram səhifəsi vasitəsi ilə 4578, feysbuk səhifəsi vasitəsi ilə 100, imeyl vasitəsi ilə 16, votsap və teleqram üzərindən 166 müraciət cavablandırılıb, eyni zamanda şöbəyə 228 zəng daxil olub. Həmçinin qəbul müddətində şöbə tərəfindən aktiv marketinq kampaniyası aparılıb, bu vaxt intervalında rəsmi sayt, instaqram, feysbuk, teleqram, votsap və linkedin kanallarında platformaların xüsusiyyətlərinə müvafiq 50 fərqli məlumatlandırıcı və istiqamətverici məzmun yayımlanıb.

Qeyd edək ki, Tədbirlərin təşkili və tələbələrlə iş, İctimaiyyətlə əlaqələr və marketinq şöbələri və ADPU-da fəaliyyət göstərən tələbə təşkilatlarının təşkilatçılığı ilə bakalavriat səviyyəsinə qəbul olunmuş tələbələrin onlayn qeydiyyatına dəstək məqsədi ilə 28 avqust - 09 sentyabr 2024-cü il tarixlərində universitetdə canlı operativ dəstək xidməti təşkil olunub. Dəstək xidmətində 300 nəfərədək abituriyent və valideynə onlayn qeydiyyat, təhsil krediti, təhsil haqqına güzəşt və s. məsələlərlə bağlı yerində xidmət və yardım göstərilib.

Hesabat dövründə, ümumilikdə 5356 əyani, onlayn və zənglə edilən müraciətə baxılıb.

Eyni zamanda I tədris ilinə qəbul olunmuş tələbələrin universitetlə bağlı məlumatlara asan çıxışlarını təmin etmək və suallarını yerində cavablandırmaq məqsədi ilə "ADPU 2024 - I kurs İnfoMərkəz" teleqram məlumatlandırma qrupu yaradılıb ki, burada yeni qəbul olunan tələbələri maraqlandıran məsələlərlə bağlı müvafiq şöbələrin və tələbə təşkilatlarının nümayəndələri tərəfindən mütəmadi məlumatlar verilir, suallar cavablandırılır. Hazırda qrupa 600 nəfərədək tələbə üzv olub ki, bu da ADPU-ya yeni qəbul olunan tələbələrin 22 faizini əhatə edir.

Vurğulamaq lazımdır ki, sadalananlarla yanaşı qəbul kampaniyası müddətində ADPU-nun müxtəlif digər strukturları və fakültələr tərəfindən də onlarla vətəndaş müraciətləri cavablandırılıb, fakültələrə yaxınlaşan abituriyent və valideynlərə zəruri kömək göstərilib.

## ADPU-nun Quba filialı Rumıniyada keçirilən beynəlxalq konfransda təmsil olunub




Sahibkarlıq və Sosial Elmlər Konqresi (EMI) ənənəvi beynəlxalq konqreslərdən biri olmaqla akademik əməkdaşlığın və mədəni kapitalın inkişafına töhfə vermək missiyasını uğurla davam etdirir. 2024-cü ilin 10-13 sentyabr tarixlərində Rumıniyanın Tarqovişte Valahia Universitetinin ev sahibliyi, Türkiyənin Kocaeli Universitetinin Biznesin idarə edilməsi fakültəsinin tərəfdaşlığı ilə hibrid formada keçirilən X Sahibkarlıq və Sosial Elmlər Konqresində Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Quba filialının direktoru, dosent Yusif Aliyev və filialın əməkdaşı - gənc alim Sərxan Cəfərov təmsil da olunublar. Filialın konqres təmsilçiləri tədbir çərçivəsində ayrı-ayrı bölmələrdə çıxış edib, digər ölkələrdən olan həmkarları ilə ikitərəfli elmi müzakirələr keçiriblər. Qeyd edək ki, konqresdə Azərbaycan, Türkiyə, Rumıniya, Özbəkistan, Böyük Britaniya, Şimali Kipr Türk Respublikası, ABŞ, Dubay, Birləşmiş Ərəb Əmirlikləri, Kanada, Hindistan, Norveç, Ukrayna, İtaliya, Yeni Zelandiya, Argentina, Qazaxıstan, Pakistan, Bəhreyn, Marakeş və Nigeriyadan olan alimlər iştirak ediblər.

Konqresə təqdim olunan hər bir məqalə dərc olunacaq və Qiymətləndirmə Şurası tərəfindən seçilən müvəffəqiyyətli məqalələrə "Ən yaxşı məqalə mükafatı" veriləcək. Bununla yanaşı tədbirdə "Türk dünyası çalıştayı" və "Türk dünyası" xüsusi sessiyaları da təşkil olunub. Bu səbəbdən bu sahələr üzrə yazıları təşviq etmək üçün "Türk dünyasında sahibkarlıq" mükafatı da təsis edilib.

## ADPU-nun alimləri COP29-a həsr olunan beynəlxalq konfransda iştirak ediblər



17-18 sentyabr tarixlərində Azərbaycan Respublikası Elm və Təhsil Nazirliyi, nazirliyin tabeliyində Botanika İnstitutu, Quraq Ərazilərdə Biomüxtəlifliyin Mühafizəsi İttifaqı (BCAA) və Azərbaycan Botaniklər Cəmiyyəti İctimai Birliyinin birgə təşkilatçılığı ilə Botanika İnstitutunda COP29-a həsr olunmuş "Qarabağ və Şərqi Zəngəzurun aran ərazilərinin florasında problemlər və həlli yolları" adlı beynəlxalq konfrans keçirilib. Tədbirin açılış mərasimində Çin Elmlər Akademiyasının Sincan Ekologiya və Coğrafiya İnstitutunun baş direktoru, BCAA-nın təsisçisi və prezidenti professor Zhang Yuanminq, Elm və Ali Təhsil üzrə Dövlət Agentliyinin Elmi müəssisələrlə iş şöbəsinin müdiri Mübariz Hacıbəyov, ADPU-nun rektoru professor Cəfər Cəfərov, beynəlxalq əlaqələr üzrə prorektoru professor Mahirə Hüseynova, Kimya və biologiya fakültəsinin dekanı dosent Reyhan Ağayeva, dekan müavini dosent Bəsti Əsədova, Biologiya və onun tədrisi texnologiyası kafedrasının müdiri dosent Anaxanım Yusifova, eləcə də Elm və Təhsil Nazirliyinin Dendrologiya İnstitutu, A.İ.Qarayev adına Fiziologiya İnstitutu, Zoologiya İnstitutu, "Mərkəzi Nəbatat Bağı" Publik Hüquqi Şəxsin nümayəndələri, yerli və beynəlxalq tədqiqatçı alimlər və mütəxəssislər iştirak ediblər.

Əvvəlcə tədbir iştirakçıları institutun foyesində müəssisə alimlərinin elmi nailiyyətlərini əks etdirən sərgiyə baxıb, Herbari Fondunda saxlanılan yerli və xarici floraya aid nümunələrin saxlanılma şəraiti ilə tanış olublar.

Tədbiri Botanika İnstitutunun baş direktoru, prof. Səyyarə İbadullayeva açaraq COP29-a həsr olunmuş beynəlxalq konfransın yerli və beynəlxalq ekspertləri bir araya gətirməklə iqlim dəyişmələri, onların ətraf mühitə təsiri məsələlərinin həlli üzrə beynəlxalq təcrübələri bölüşmək məqsədi ilə keçirildiyini diqqətə çatdırıb.

Prof. S.İbadullayeva "Qarabağın dünəni, bugünü və sabahı" mövzusunda çıxış edərək Qarabağ və Şərqi Zəngəzurda aparılan monitorinq və çöl-tədqiqat işlərinin nəticələri haqqında məlumat verib. Məruzəçi sözügedən ərazilərə dəyən ziyanın qiymətləndirilməsinə aydınlıq gətirib.

Daha sonra Elm və Ali Təhsil üzrə Dövlət Agentliyinin rəsmisi Mübariz Hacıbəyov beynəlxalq konfransın keçirilməsini COP29-a gedən yolda müəyyən edilmiş hədəflərə nail olmaq üçün həyata keçirilən təşəbbüslərdən biri kimi qiymətləndirib. Konfransın plenar hissəsində müxtəlif istiqamətlər üzrə yerli və xarici alimlərin təqdimatında məruzələr dinlənilib, geniş müzakirələr aparılıb.

Tədbirin davamında "Azərbaycan Televiziyası"nda (AZTV) "Qarabağ və Şərqi Zəngəzurun aran ərazilərinin florasında problemlər və həlli yolları" adlı beynəlxalq konfransa həsr olunmuş dəyirmi masa keçirilib.

Sonda konfransın bəyannaməsi hazırlanıb və iştirakçılara sertifikatlar təqdim olunub.

## Qocaman müəllimlə duyğulandıran yolasalma mərasimi



Son illərdə Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) qocaman professor-müəllimlərin təqaüdə təntənəli şəkildə yola salınması ənənəsi formalaşmaqdadır. Sentyabrın 18-də ADPU-nun İbtidai təhsilin pedaqogikası kafedrasında baş müəllim Çiçək Bəhram qızı Hümbətovanın təqaüdə yola salınması ilə bağlı tədbir keçirilib.

Tədbiri giriş sözü ilə açan kafedranın müdiri professor Fərrux Rüstəmov vaxtı ilə ona dərs demiş Çiçək xanımın elmi-pedaqoji fəaliyyəti haqqında geniş danışıb. Qeyd edib ki, 1970-ci ildə Azərbaycan Dövlət Pedaqoji İnstitutunun (indiki ADPU) İbtidai təhsilin pedaqogikası və metodikası fakültəsini bitirən Ç.Hümbətova 1971-ci ildən indiyə kimi İbtidai təhsilin pedaqogikası kafedrasında baş lobarant, müəllim və baş müəllim vəzifələrində çalışıb. 2 metodik tövsiyənin, 40 elmi məqalənin müəllifidir. 5 məqaləsi xarici ölkələrin nüfuzlu elmi jurnallarında nəşr olunub. İşlədiyi dövrdə yüksək əxlaqi keyfiyyətləri, peşəkarlığı ilə seçilib. Universitetin və fakültənin elmi və ictimai həyatında fəal iştirak edib, professor-müəllim heyətinin və tələbə kolektivinin sevimlisi olub. "Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illiyi (1921-2021)" yubiley medalı ilə təltif olunub.

Sonra fakültənin dekanı prof. Qızxanım Qəhrəmanova Çiçək müəllim haqqında xatirələrini bölüşüb, onu peşəkar müəllim, gözəl ailə başçısı, humanist və xeyirxah həmkar kimi dəyərləndirib. ADPU-nun rektoru, prof. Cəfər Cəfərovun adından təltif olunduğu Fəxri Fərmanı Çiçək xanıma təqdim edilib. Ardınca təəssüratlarını bölüşən kafedra əməkdaşları Çiçək xanımı dəyərli insan və örnək müəllim kimi dəyərləndirərək ondan çox şey öyrəndiklərini dilə gətiriblər.

Tədbirin sonunda öz xahişi ilə doğma kollektivdən ayrılan Çiçək xanım çıxış edərək ADPU-nun rektoru prof. C.Cəfərova, fakültə və kafedra rəhbərliyinə və həmkarlarına öz təşəkkürünü bildirib.

## Yüksək göstəricilərlə ADPU-nu seçən tələbələr belə mükafatlandırıldı - Pedaqoji Universitetdən maraqlı təşəbbüs






Sentyabrın 19-da Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) 600-dən yüksək balla ADPU-nu seçmiş, həmçinin idman sahəsindəki uğurlarına görə müsabiqədənkənar qaydada universitetə qəbul olunmuş tələbələrlə görüş keçirilib. Görüşdə universitet rəhbərliyi, fakültə dekanları, tələbələr və onların valideynləri iştirak ediblər.

Qeyd edək ki, 2024/2025-ci tədris ili üçün ali təhsil müəssisələrinin bakalavriat səviyyəsinə tələbə qəbulunun nəticələrinə əsasən 600-dən yuxarı bal toplayan abituriyentlərdən 8 nəfəri ADPU-nun müxtəlif fakültələrinə, 5 nəfəri isə ADPU-nun filiallarına qəbul olunub. ADPU-nun fakültələrinə qəbul olunan tələbələrdən 4-ü universitetin Riyaziyyat və informatika müəllimliyi, 2-si Riyaziyyat müəllimliyi, 1-i Azərbaycan dili və ədəbiyyatı müəllimliyi, 1-i isə Xarici dil müəllimliyi ixtisasında təhsil alacaq. Həmçinin, 6 nəfər olimpiya və beynəlxalq idman yarışlarının qalibləri və mükafatçıları isə müsabiqədənkənar qaydada ADPU-nun Fiziki tərbiyə və çağırışaqədərki hazırlıq müəllimliyi ixtisasına qəbul ediliblər.

Görüşü giriş sözü ilə açan Universitetin rektoru professor Cəfər Cəfərov tələbələri salamlayaraq onları Pedaqoji Universitet ailəsinin üzvləri sıralarına qoşulmaları münasibəti ilə təbrik edib. Prof. C.Cəfərov qəbul imtahanlarında yüksək nəticələr göstərmiş tələbələrin təhsil sahəsində uğurlarının davamlı olacağına, peşəkar müəllim kadrları olaraq təhsilin inkişafına töhfə verəcəklərinə inandığını bildirib. Beynəlxalq idman yarışlarında ölkəmizi uğurla təmsil edən tələbələrə təşəkkürünü bildirən rektor gənclərin idman sahəsində ölkəmizin bayrağını daha yüksək zirvələrdə dalğalandırmalarını arzulayıb, həmçinin gələcəyin müəllimləri olaraq bacarıq və təcrübələri ilə sağlam gəncliyin yetişməsində faydalı işlər görəcəklərinə əmin olduğunu qeyd edib.

Daha sonra Pedaqoji Universitet adından tələbələrə hədiyyələr təqdim edib. 600-dən yüksək bal toplayan tələbələrin hər birinə qəbul imtahanlarında topladıqları bal miqdarında, müsabiqədənkənar qaydada qəbul olunmuş tələbələrə isə müəyyən olunmuş məbləğdə maddi mükafat, həmçinin, bütün tələbələrə universitetin xatirə hədiyyələri verilib. Öz təəssüratlarını bölüşən valideynlər göstərilən diqqət və qayğıya görə universitet rəhbərliyinə minnətdarlıqlarını bildirib, tələbələr bundan sonrakı uğurlarının daha böyükmiqyaslı olacağına, Pedaqoji Universitetdə müəllimlik ixtisasının sirlərinə yiyələnərək gələcəyin qurucularını yetişdirəcək peşəkarlar kimi formalaşacaqlarına əminliklərini ifadə ediblər.

## ADPU-nun şöbə müdiri beynəlxalq reytinq qiymətləndirmələri ilə bağlı təlimdə iştirak edib



18-19 sentyabr tarixlərində ali təhsil müəssisələrinin nümayəndələrinin beynəlxalq reytinq qiymətləndirmələri haqqında məlumatlarını artırmaq məqsədilə təlim və komanda quruculuğu görüşləri keçirilib. Təlimdə bir çox ali təhsil müəssisəsinin beynəlxalq reytinqlər üzrə məsul şəxsləri iştirak edib. Elm və Ali Təhsil üzrə Dövlət Agentliyinin təşkilatçılığı ilə keçirilən təlimdə QS-in (Quacquarelli Symonds) regional direktoru Sergey Xristoliubov iştirakçılara müvafiq sahə üzrə ən son tendensiyalar haqqında məlumat verib. Görüşdə iştirak edən Pedaqoji Universitetin Keyfiyyətin təminatı şöbəsinin müdiri dosent Qalib Şərifov qabaqcıl təcrübə və ADPU-nun beynəlxalq reytinqlərdə irəliləməsi ilə bağlı müzakirələr aparıb. Qeyd edək ki, təlim zamanı beynəlxalq reytinqlərin ali təhsil müəssisələrinin qlobal rəqabətə davamlılığının artırılmasında rolu, reytinq göstəricilərinin yaxşılaşdırılması üçün yaradılan imkanlar və prosesdə yaranan çətinliklər barədə geniş müzakirələr aparılıb.

## Moskva Dövlət Pedaqoji Universitetinin nümayəndələri ADPU-da olub



Sentyabrın 19-da Moskva Dövlət Pedaqoji Universitetinin (MDPU) beynəlxalq əlaqələr üzrə prorektorunun müavini dosent Olqa Marozova və həmin universitetin Dərbənd filialının direktoru dosent Ruslan Hüseynov Azərbaycan Dövlət Pedaqoji Universitetini (ADPU) ziyarət ediblər.

Görüşdə ADPU-nu rektor prof. Cəfər Cəfərov və Beynəlxalq əlaqələr şöbəsinin müdiri Günay Məhərrəmova təmsil ediblər. Görüş zamanı tərəflər arasında ikitərəfli əməkdaşlıq imkanları müzakirə olunub və əməkdaşlıq müqaviləsinin bağlanması barədə razılıq əldə edilib.

## Pedaqoji Universitetdə "Huma Quşu" Fondunun təqdimatı keçirilib



Sentyabrın 20-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) "Huma Quşu" Təhsilə Yardım Fondunun təqdimat mərasimi keçirilib.

Tədbirdə Pedaqoji Universitetin və Fondun rəhbərliyi, eləcə də Azərbaycan Respublikasının Bosniya və Herseqovinadakı fövqəladə və səlahiyyətli səfiri Vilayət Quliyev, universitetin professor-müəllim heyəti və tələbələri iştirak ediblər.

Tədbiri giriş sözü ilə açan ADPU-un rektoru professor Cəfər Cəfərov Fondun təhsil və mədəniyyət sahəsinə göstərdiyi dəstəkdən söz açıb, təsisçilərə bu əhəmiyyətli təşəbbüs üçün təşəkkürünü bildirib. Prof. C.Cəfərov qeyd edib ki, Fond Humay Quliyevanın xatirəsini yaşatmaq və Humay üçün vacib olan xeyriyyəçilik, insansevərlik, vətənpərvərlik, cəsarət və başqa dəyərləri yaşatmaq məqsədi ilə yaradılıb. Təhsil sahəsində fond və universitetin vahid hədəflərinə diqqət çəkən rektor gəncləri onlar üçün yaradılan bu və digər fürsətlərdən faydalanaraq peşəkar, hərtərəfli, müasir dövrün tələblərinə uyğun kadr kimi formalaşdırmağa çağırıb. Daha sonra Humayın dostları tərəfindən hazırlanmış "Yerin hər zaman görünəcək, Humay" filmi nümayiş etdirilib.

Çıxış edən "Huma Quşu" Təhsilə Yardım Fondunun sədri Şəhla Vəzirova fondun iki illik fəaliyyət dövrü ərzində 6 proqram çərçivəsində 30-a yaxın qazi və tələbənin təhsilinə dəstək verildiyini bildirib. Ş.Vəzirova fond tərfindən aztəminatlı ailələrdən olan gənclərin təhsil imkanlarının artırılması məqsədilə "ADA Universitetinin Təqaüd proqramı" (3 qrant) və 2024-cü ilin Payız çağırışı formatında "Kiçik qrantlar" proqramında (3 qrant) iştirak qaydaları barədə təqdimat edib. Təəssüratlarını bölüşən "Kiçik qrantlar" müsabiqəsinin qalibi Çinarə Qasımova "Huma Quşu" Fondunun onun həyatına və təhsilinə etdiyi dəyişikliklərdən danışıb.

Sonda fond nümayəndələri tərəfindən qrant və təqaüd proqramları barədə tələbələrə maraqlı olan suallar cavablandırılıb.

## Pedaqoji Universitetdə təhsil almaq istəyən əcnəbilərin müsahibəsi keçirilib



Sentyabrın 23-də 2024/2025-ci tədris ili üçün Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) bakalavriat və magistratura səviyyələrində, həmçinin hazırlıq kurslarında təhsil almaq üçün portal.edu.az saytında qeydiyyatdan keçərək müraciət edən əcnəbi vətəndaşların müsahibəsi keçirilib.

ADPU-nun Müsahibə Komissiyasının iclasında Türkiyə, Rusiya, Gürcüstan və Pakistandan olan namizədlər iştirak ediblər. Komissiyanın sədri, rektor professor Cəfər Cəfərov, sədr müavini beynəlxalq əlaqələr üzrə prorektor professor Mahirə Hüseynova, üzvləri isə elm və innovasiyalar üzrə prorektor professor Asəf Zamanov, tədris işləri üzrə prorektor dosent Eldar Aslanov, sosial və Humaitar məsələlər üzrə prorektor professor Fikrət Rzayev, Ümumi işlər üzrə prorektor Tural Cəlilov, rektorun müşaviri Ümid Mehdiyev, Tədris departamentinin direktoru dosent Sənan Əliyev, Magistratura və doktorantura şöbə¬si¬nin¬ müdiri, s.e.f.d. Rəşad Sadıqov və Əcnəbi tələbələrlə iş şöbəsinin müdiri Dürdanə Əliyevadır.

Müsahibə zamanı namizədlərə dil bilgiləri, dünyagörüşü, bitirdikləri ixtisaslar barədə suallar ünvanlanıb. Yekunda Komissiya üzvləri tərəfindən müsbət dəyərləndirilmiş əcnəbi namizədlərin universitetin bakalavriat və magistratura səviyyələri üzrə birinci tədris ilinə, həmçinin hazırlıq kurslarına qəbul olunmaları haqqında qərar verilib.

## Məktəbəqədər təhsil müəssisələrinin əməkdaşları üçün peşəkar inkişaf marafonu təşkil edilib



Məktəbəqədər və Ümumi Təhsil üzrə Dövlət Agentliyi (MÜTDA) və Azərbaycan Dövlət Pedaqoji Universitetinin Strateji İnkişaf Mərkəzinin (ADPU SİM) birgə təşkilatçılığı ilə məktəbəqədər təhsil müəssisələrinin əməkdaşları Pedaqoji Universitetdə iki günlük peşəkar inkişaf marafonunda iştirak ediblər.

Marafonda ADPU-nun strateji inkişaf məsələləri üzrə prorektoru Könül Pirverdiyeva tərəfindən "Təhsilin idarə olunması: XXI əsrdə dəyişikliyə rəhbərlik və liderlik" mövzusunda seminarda təhsil müəssisələrində müasir idarəetmə mexanizmlərinə dair əsas çağırışlar iştirakçıların diqqətinə çatdırılıb. Seminarın ikinci hissəsində "Xor" filmi nümayiş olunub, film əsasında iştirakçılarla idarəetməyə dair fikir mübadiləsi aparılıb.

ADPU-nun Strateji İnkişaf Mərkəzinin əməkdaşı Zarina Nəbizadə "Uşaq bağçalarında təşkilati mədəniyyətin formalaşdırılması" mövzusunda təqdimatla çıxış edərək öyrənən təşkilatlar, açıq sistemlər kimi təşkilati mədəniyyətin önəmli anlayışlarını izah edib. Marafonda, həmçinin "Məktəbəqədər təhsildə keyfiyyət təminatı", "Kommunikasiya bacarıqları və İKT: müasir bağça idarəetməsi üçün alətlər", "Bağçada sağlam psixoloji mühitin təşkili", "Beynəlxalq (Finlandiya və Kipr) təcrübə paylaşımı və bağça sənədləri ilə işin təşkili" və s. kimi mövzularda peşəkar təlimçilər tərəfindən seminarlar keçilib. İki günlük marafonun sonunda məmnuniyyət sorğusu həyata keçirilib.

## Tələbələr Cəlil Məmmədquluzadənin ev muzeyində olublar



Azərbaycan Dövlət Pedaqoji Universiteti Təhsil Könüllüləri Tələbə Birliyi (ADPU TKTB) və Tarix və coğrafiya fakültəsinin birgə təşkilatçılığı ilə tələbələrin Cəlil Məmmədquluzadənin ev muzeyinə ekskursiyası təşkil olunub.

Muzeydə gənclər dahi ədib uşaqlıq, gənclik və təhsil illərini, məktəbdarlıq fəaliyyətini, ilk yaradıcılıq addımlarını və mühitini, onun ilk jurnalistlik və ədəbi fəaliyyətini əks etdirən eksponatlarla yaxından tanış olublar. Ekskursiyada 50-ə yaxın tələbə iştirak edib.

## "Pedaqoji Universitetin Gələcək Təhsil Liderləri" müsabiqəsinin mentorluq proqramına start verilib



Pedaqoji Universitetin Gələcək Təhsil Liderləri | bp | PRESTİJ-S | İT BRAINS Academy

Sentyabrın 26-da Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) "Pedaqoji Universitetin Gələcək Təhsil Liderləri" müsabiqəsinin qalibləri və xüsusi mükafatçılarının mentorluq proqramının başlanması ilə bağlı görüş keçirilib.

Çıxış edən ADPU-nun sosial və humanitar məsələlər üzrə prorektoru professor Fikrət Rzayev müsabiqənin universitetin potensiallı tələbələrinin üzə çıxarılaması, gənclərin peşəkar kadr kimi yetişmələri baxımından əhəmiyyətindən danışıb. Prof. F.Rzayev diqqətə çatdırıb ki, universitetin bakalavriat və magistratura səviyyələrində təhsil alan tələbələri arasında keçirilən müsabiqədə 1000-ə yaxın tələbə-gənc iştirak edib. 4 mərhələdən ibarət müsabiqənin yekununda 10 nəfər tələbə qalib, 10 nəfər isə xüsusi mükafatçı olaraq fərqlənməyi bacarıb. Prorektor qeyd edib ki, hər bir qalib 1000 AZN pul mükafatı, 1 illik xarici dil və İT kursları kimi mükafatlarla yanaşı, həm də Təşkilat Komitəsinin üzvü olan ADPU-nun rəhbər heyəti ilə 1 illik mentorluq proqramından faydalanmaq şansı əldə ediblər. Prorektor tələbələrə artıq start götürən mentorluq proqramında uğurlar arzu edib, onları bu şansdan yüksək səviyyədə faydalanmağa və təşəbbüskar olmağa çağırıb.

Universitetin İctimaiyyətlə əlaqələr və marketinq şöbəsinin müdiri səlahiyyətlərinin icraçısı, layihənin işçi qrupunun rəhbəri Taleh Mirzəyev mentorluq proqramının qrafiki, iştirakçıların qarşısına qoyulan tələblər və digər qaydalar haqqında məlumat verib. O, vurğulayıb ki, növbəti həftədən start götürəcək proqram çərçivəsində mentilər universitet rəhbərliyi və sturukutur rəhbərlərindən ibarət mentorları ilə mütəmadi görüşlər keçirəcək, onların təcrübələrindən faydalanmaqla yanaşı real iş mühitində öyrəndiklərini tətbiq etmək fürsəti qazanacaqlar.

T.Mirzəyev mentorluq proqramının müsabiqə qalibləri və xüsusi mükafatçıların şəxsi və peşəkar inkişafları, eləcə də gələcək karyera imkanları üçün əhəmiyyətini diqqətə çatdırıb, proqramla bağlı iştirakçıları maraqlandıran sualları cavablandırıb.

Qeyd edək ki, ADPU və onun filiallarının bakalavriat və magistratura səviyyəsində təhsil alan tələbələr üçün təşkil olunan "Pedaqoji Universitetin Gələcək Təhsil Liderləri" müsabiqəsinin keçirilməsində əsas məqsəd universitetin istedadlı tələbələrini aşkar edərək onların peşəkar inkişafına dəstək olmaq və gələcək kadr bankı formalaşdırmaqdır.

"bp Azərbaycan", "Prestij-S" Tədris Mərkəzi və "İT Brains Academy" müsabiqənin sponsorlarıdır.

## ADPU-nun Vətən müharibəsində şəhid olan tələbə və məzunları



Azərbaycan Dövlət Pedaqoji Universitetinin tələbə və məzunları Vətən müharibəsində yaxından iştirak edib. Universitetin onlarla tələbəsi və yüzlərlə məzunu Vətən müharibəsi qazisi, 16 tələbə və məzunu Vətən müharibəsi şəhidi, 1 məzunu isə 2022-ci ilin Sentyabr döyüşləri şəhididir.

## Pedaqoji Universitetdə Vətən müharibəsi şəhidləri anılıb



Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) 27 Sentyabr - Anım Günü münasibətilə 44 günlük Vətən müharibəsi şəhidlərinin anım mərasimi keçirilib. Anım mərasimi ərazi bütövlüyümüzün müdafiəsi, dövlət suverenliyinin bərpası uğrunda canından keçmiş şəhidlərimizin ruhlarına ehtiram əlaməti olaraq bir dəqiqəlik sükutla başlayıb. Universitet rəhbərliyi tərəfindən universitetdə ali təhsil ocağında yaradılmış "Zəfər guşəsi" ziyarət edilib, guşəyə tər çiçəklər düzülüb. Mərasim iştirakçıları müasir Azərbaycanın və dövlət müstəqilliyimizin memarı olan Ulu Öndər Heydər Əliyevin universitetin foyesində ucaldılmış abidəsinini ziyarət edib, ruhunu ehtiramla yad ediblər.

Həmçinin, universitetin fakültələrində də Anım Günü müxtəlif tədbirlərlə qeyd olunub, vətən uğrunda canlarından keçən qəhrəman övladların xatirələri yad olunub.

## Pedaqoji Universitetin Şamaxı filialında Anım Günü tədbiri: "Zəfərə gedən yolun başlanğıcı"



ADPU-nun Şamaxı filialında 27 Sentyabr - Anım Gününə həsr olunmuş "Zəfərə gedən yolun başlanğıcı" adlı tədbir keçirilib. Tədbirdən öncə filial rəhbərliyi və kollektivi Şamaxı şəhərində yerləşən Şəhidlər xiyabanını ziyarət edib.

Filialın direktoru dosent Tünzalə Yusifova, şəhid ailələri, professor-müəllim heyəti və tələbələrin iştirak etdiyi tədbirdə ilk olaraq ölkəmizin suverenliyi və ərazi bütövlüyü uğrunda şəhidlik zirvəsinə ucalan vətən övladlarının xatirəsi bir dəqiqəlik sükutla yad olunub və Dövlət Himni səsləndirilib. Ardınca 27 Sentyabr - Anım Gününə həsr olunmuş videoçarx nümayiş olunub.

Direktor dosent Tünzalə Yusifova qeyd edib ki, 2020-ci ilin 27 sentyabrında başlayan və 44 gün davam edən Vətən müharibəsində cəsur, qəhrəman oğullarımız göstərdikləri şücaətlə bir daha sübut etdilər ki, xalq şəhid verirsə, deməli, o xalq böyük xalqdır. Müzəffər Ali Baş Komandan cənab İlham Əliyevin rəhbərliyi, Azərbaycan Ordusunun rəşadəti, xalq və dövlətin birliyi ilə 44 gün davam edən İkinci Qarabağ müharibəsində qazanılan Zəfər Azərbaycan tarixinin ən parlaq səhifələrindən biri kimi yaddaşlara yazıldı. Qarabağı, işğalda olan torpaqlarımızı geri qaytarmaq üçün düşünmədən canından keçən, xalqımızın Vətən həsrətinə son qoyaraq, qalib ölkənin vətəndaşı olmaq sevincini bizlərə yaşadan şəhidlərimiz bizim qürur mənbəyimizdir.

Ardınca çıxışlar dinlənilib. Sosial və xüsusi fənlər kafedrasının müəllimi dos. Mayıl Alıcanov "Zəfərə gedən yolun başlanğıcı", Riyaziyyat və kompüter elmləri kafedrasının baş müəllimi Çingiz Dadaşov "44 günlük Vətən müharibəsi şanlı tariximizdir", Dil-ədəbiyyat və onların tədrisi texnologiyası kafedrasının müəllimi Türkan Hüseynova "Zəfər tariximiz incəsənətdə", Pedaqogika və psixologiya kafedrasının müəllimi Əsmər Əliyeva "Zəfər tariximizin vətənpərpərlik tərbiyəsində rolu" mövzusunda ətraflı çıxış ediblər. Daha sonra şəhid valideynləri - filialın şəhid məzunu leytenant Orxan Nəbiyevin atası Rza Nəbiyev, şəhid Ziyad Zərbalıyevin anası Pakizə Zərbalıyeva və şəhid Zahir Manafovun atası Zakir Manafov çıxış edərək öz ürək sözlərini bölüşüblər.

Bədii hissədə tələbələrin ifasında şeir kompozisiyası səsləndirilib, daha sonra filialın həyətyanı sahəsində şəhid məzunlara həsr olunmuş abidə ziyarət olunub.

## ADPU kollektivi Zəfər parkını ziyarət edib



27 Sentyabr - Anım Günü münasibətilə Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rəhbərliyi, professor-müəllim heyəti və tələbələr Zəfər parkında olublar.

44 günlük Vətən müharibəsi şəhidlərinin xatirələrinin əbədiləşdirilməsi məqsədilə parkın girişində qoyulmuş xatirə daşının önünə gül dəstələri düzülüb. Vətənimizin azadlığı, ərazi bütövlüyü və dövlət suverenliyinin bərpası uğrunda canından keçmiş şəhidlərimizin əziz xatirəsi ehtiramla yad edilib.

## "Yaşıl dünya naminə həmrəylik ili" və COP29-a həsr olunmuş görüş



Pedaqoji Universitetin (ADPU) Heydər Əliyev Mərkəzində Azərbaycan Respublikasının Energetika Nazirliyi yanında İctimai Şuranın təşəbbüsü ilə "Gənc nəslin "Yaşıl dünya naminə həmrəylik ili" çərçivəsində COP29 və bərpa olunan enerji mənbələri haqda maarifləndirilməsi, Azərbaycanın bu prosesdə oynadığı rol və cəmiyyətin gözləntiləri" mövzusunda görüş keçirilib. Tədbirdə İctimai Şuranın üzvləri, ADPU-nun professor-müəllim heyəti və tələbələr iştirak edib.

Giriş nitqi ilə çıxış edən ADPU-nun Heydər Əliyev Mərkəzinin müdiri Tahir Süleymanov mərkəzin fəaliyyəti, COP29-un mahiyyəti, əhəmiyyəti və ona hazırlıq çərçivəsində ölkə miqyasında görülən işlər haqqında məlumat verib.

Energetika Nazirliyi yanında İctimai Şuranın sədri Şaban Nəsirov dövlətimizin beynəlxalq nüfuzunun artmasında COP29-un və bərpa olunan enerji mənbələrinin inkişafı yönündə həyata keçirilən tədbirlərin əhəmiyyətindən danışıb.

Şuranın sədr müavini Mehriban Abdullayeva çıxışında vətəndaşların iqlim dəyişiklikləri, yaşıl enerjinin əhəmiyyəti ilə bağlı maarifləndirilməsi yönündə görülən işlərdən bəhs edib.

Daha sonra İctimai Şuranın katibi Samir Həsənov "Bərpa olunan enerji mənbələri, elektrik enerjisi və suya qənaət", Şura üzvü Sadiq Həsənov "İstilik elektrik stansiyalarının ətraf mühitə təsiri" mövzularında təqdimatlar ediblər. Energetika Nazirliyinin mətbuat katibi Cahid Mikayılov nazirliyin yaşıl enerjinin inkişafı istiqamətindəki fəaliyyəti barədə məlumat verib və sualları cavablandırıb. İnteraktiv şəkildə keçən görüşdə ADPU-nun Tarix və coğrafiya fakültəsinin kafedra müdirləri Məhəmməd Abduyev və Oqtay Alxasov çıxış ediblər.

## Panel görüş: "Qarabağ: Qəhrəmanların dastanı"



Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) ADPU Təhsil Könüllüləri Tələbə Birliyi (ADPU TKTB), Azərbaycan Respublikası Gənclər Fondunun (AR GF) dəstəyi, Azərbaycan Respublikası Gənclər Təşkilatları Milli Şurası (NAYORA) və "Böyük Qayıdış" Gənclər Təşkilatının birgə təşkilatçılığı ilə "Qarabağ: Qəhrəmanların dastanı" adlı panel görüş keçirilib.

Tədbir şəhidlərimizin əziz xatirəsinin bir dəqiqəlik sükutla yad edilməsi ilə başlayıb.

Çıxış edənlərdən Pedaqoji Universitetin sosial və humanitar məsələlər üzrə prorektoru professor Fikrət Rzayev, Milli Məclisin deputatı Naqif Həmzəyev, Gənclər Fondunun Gənclər təşkilatları ilə iş şöbəsinin müdiri Orduxan Qəhrəmanzadə, NAYORA-nın baş katibi Nərminə Hüseynzadə və "Böyük Qayıdış" Gənclər Təşkilatının sədri Nail Şükürov Qarabağ müharibəsi, qəhrəmanlıq dastanları və gənclərin rolu haqqında ətraflı danışaraq vacib fikirlər səsləndiriblər.

Çıxışlardan sonra panel müzakirəsi başlayıb. Müzakirədə tanınmış jurnalist Jalə Həsənli və 44 günlük Vətən müharibəsində iştirak etmiş qazilərimiz yer alıblar. Onlar müharibə dövründə yaşadıqları döyüş xatirələrini bölüşüblər. Eyni zamanda, Vətən müharibəsinin əhəmiyyəti, bu mübarizənin gənclərin gələcəyinə təsiri və gənclərin informasiya müharibəsindəki rolu barədə də fikirlərini ifadə edibər.

## Prof. Mahirə Hüseynova Özbəkistanın Cizzak Dövlət Pedaqoji Universitetinin fəxri professoru seçilib



Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) beynəlxalq əlaqələr üzrə prorektoru, filologiya elmləri doktoru, professor Mahirə Hüseynova və universitetin Müasir Azərbaycan dili kafedrasının müdiri dosent Könül Səmədova Özbəkistanın Cizzak Dövlət Pedaqoji Universitetinin 50 illiyi ilə bağlı keçirilən "Təhsilin inkişafı strategiyası dəyərlərə əsaslanan tərəqqidir" adlı elmi-praktik konfransda iştirak ediblər.

Prof. Mahirə Hüseynova konfransda çıxış edərkən ADPU-nun Qafqazın ən qədim pedaqoji təhsil müəssisəsi olduğunu qeyd edərək Azərbaycan Prezidenti İlham Əliyevin Özbəkistana səfəri zamanı vurğuladığı Azərbaycan-Özbəkistan dostluq münasibətlərini xatırladıb. O, həmçinin Cizzak Dövlət Pedaqoji Universitetinin Özbəkistanın təhsil sahəsində qazandığı uğurlardan bəhs edərək bu universitetin regionda təhsilin inkişafına böyük töhfə verdiyini qeyd edib.

Konfransda, həmçinin Cizzak Dövlət Pedaqoji Universitetinin 50 illiyi ilə əlaqədar prof. Mahirə Hüseynovaya bu ali məktəbin fəxri professoru adı verilməsi ilə bağlı diplom təqdim edilib.

Müxtəlif bölmələrdə işini davam etdirən konfransda dos. Könül Səmədova Avropa və türk dünyasının təhsil sistemlərinin təcrübələrinin Azərbaycanda tətbiqi məsələlərinə dair mühazirə ilə çıxış edib.

Səfərin ikinci günündə prorektor prof. Mahirə Hüseynova ilə Cizzak Dövlət Pedaqoji Universitenin rektoru Şövkət Şərifov arasında keçirilən görüşün yekununda memorandum imzalanıb.

Bundan əlavə, Mahirə Hüseynova Cizzak Dövlət Pedaqoji Universitetinin tələbələri ilə görüş keçirib. Tələbələr qarşısında elmi mühazirə ilə çıxış edən prorektor öz yaradıcılığına aid şeirlərdən də parçalar səsləndirib. Onun "Əsr Türkün əsridir" adlı mahnısı da auditoriyada səslənib və tələbələr tərəfindən maraqla qarşılanıb. Görüşün sonunda tələbələr prof. Mahirə Hüseynovaya verdiyi dəyərli biliklər və maraqlı çıxış üçün təşəkkür ediblər.

Tiraj - 500
Şəhadətnamə - № 191

# GƏNC MÜƏLLİM QƏZETİ

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİ

## ADPU və Moskva Dövlət Pedaqoji Universiteti əməkdaşlıq müqaviləsi imzalayıblar



Sentyabrın 25-də Moskva Dövlət Universitetinin İntellektual Mərkəzində - Fundamental Kitabxanada I Rusiya-Azərbaycan Elm və Təhsil Forumu keçirilib. Forumda Rusiya və Azərbaycan tərəfindən elm və təhsil sahəsinin rəsmiləri, o cümlədən Rusiyanın elm və ali təhsil naziri Valeri Falkov, Azərbaycan Respublikası elm və təhsil nazirinin müavini Firudin Qurbanov, Rusiya Rektorlar İttifaqının prezidenti və Moskva Dövlət Universitetinin rektoru Viktor Sadovniçi iştirak ediblər.

Foruma iki ölkədən 70-dən çox ali təhsil müəssisəsinin nümayəndələri qatılıblar. Tədbirdə müvafiq dövlət qurumlarının, Rusiya Federasiyası ilə Azərbaycan Respublikasının elmlər akademiyalarının nümayəndələri təbrik və məruzələrlə çıxış ediblər.

Forumda iştirak edən Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rektoru professor Cəfər Cəfərov "Təhsil sahəsində universitetlərarası əməkdaşlığın inkişafı" sessiyasında məruzəçi kimi çıxış edib.

Forum çərçivəsində keçirilən sessiyalar və ekspert görüşlərində Azərbaycan və Rusiya arasında ali təhsil və elm sahəsində əməkdaşlığın inkişafı, o cümlədən təhsil müəssisələri və özəl sektor arasında birgə əməkdaşlıq imkanları müzakirə olunub, həmçinin Rusiya-Azərbaycan Ali Təhsil Müəssisələri Assosiasiyasının iclası keçirilib.

Səfər çərçivəsində ADPU ilə Moskva Dövlət Pedaqoji Universiteti arasında əməkdaşlıq müqaviləsi imzalanıb. Moskva Dövlət Linqvistika Universiteti ilə olan mövcud müqavilənin yenilənməsi və əməkdaşlığın davam etdirilməsi haqqında razılıq əldə olunub.

ADPU-nun bu forumdakı iştirakı Rusiya ilə təhsil və elm sahəsində əməkdaşlığa yeni təkan verərək, universitetlərarası birgə layihələrin həyata keçirilməsi, akademik mübadilə və birgə tədqiqatların aparılmasına mühüm töhfə verəcək.

## Polşanın Rzeszow Universitetinin kafedra müdiri ADPU-da mobillikdə iştirak edib



23-27 sentyabr tarixlərində Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) ERASMUS+KA1 proqramı çərçivəsində Polşanın Rzeszow Universitetinin Sosial pedaqogika kafedrasının müdiri professor Piotr Nowakowski mobillikdə iştirak edib. Səfər zamanı prof. Piotr Nowakowski ADPU-nun İbtidai təhsil fakültəsində tədris ixtisasları üzrə mühazirələr keçib, tələbə və müəllim heyəti ilə geniş müzakirələr aparıb. Səfərin məqsədi ADPU-nun İbtidai təhsil fakültəsində tədris ixtisasları üzrə mühazirələr keçirmək, tələbə və müəllim heyəti ilə müzakirələr aparmaq və bu sahədə əməkdaşlıq əlaqələrini genişləndirməkdir.

## ADPU-da "Code for Future" layihəsinin iştirakçıları olan tələbələrlə görüş keçirilib



Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) "Code for Future" layihəsinin 4-cü mövsümünün iştirakçıları olan tələbələrlə görüş keçirilib.

"Code for Future" layihəsi 2021-ci ildən etibarən ADPU-da icra olunur. Layihənin məqsədi gənc müəllimləri informatika fənninin innovativ şəkildə tədrisinə hazırlamaq və onların peşəkar inkişafına dəstək olmaqdır.

Tədbirdə Pedaqoji Universitetin strateji inkişaf məsələləri üzrə prorektoru Könül Pirverdiyeva çıxış edərək tələbələri yeni tədris ili münasibətilə təbrik edib və 2024/2025-ci tədris ilinin bir çox mühüm yeniliklərlə yadda qalacağını qeyd edib. O, 32 ildən sonra Şuşa şəhər 1 nömrəli, Xocalı şəhər 1 nömrəli tam orta məktəblərin yenidən fəaliyyətə başlamasının və Qarabağ Universitetinin yaradılmasının müəllimlik peşəsinin əhəmiyyətinin daha da artmasına və təhsil sahəsində yeni perspektivlərin formalaşmasına şərait yaratdığını bildirib. K.Pirverdiyeva, həmçinin tələbələri layihələrdə fəal iştirak etməyə səsləyərək, bu cür təşəbbüslərin onların akademik və peşəkar inkişafına mühüm töhfə verəcəyini bildirib. O, xüsusi olaraq bu tədris ilindən etibarən "Code for Future" layihəsini uğurla başa vuran tələbələr üçün universitet tərəfindən "Lütfi Zadə təqaüdü"nün təsis olunduğunu açıqlayaraq, bu təqaüdün istedadlı gənclərin elmi potensialını stimullaşdırmaq məqsədi daşıdığını vurğulayıb. Çıxış edən "Code for Future" layihəsinin rəhbəri Nəzrin Əliyeva layihənin məqsədi, ötən tədris ilinin nəticələri, builki tələbələrdən gözləntilər və layihə çərçivəsində planlanlardan bəhs edərək iştirakçılara ətraflı məlumat verib.

Tədbirin sonunda tələbələri maraqlandıran suallar cavablandırılıb. Qeyd edək ki, "Code for Future" layihəsi çərçivəsində cari tədris ilində "Python" kursunun genişləndirilməsi və "MİQ" kursuna kurikulum dərslərinin əlavə edilməsi nəzərdə tutulub.




## BAŞSAĞLIĞI










Azərbaycan Dövlət Pedaqoji Universitetinin rəhbərliyi və professor-müəllim heyəti adından mərhum əməkdaşlarımız və tələbəmizin yaxınlarına dərin hüznlə başsağlığı veririk!

Allah rəhmət eləsin!

**İlham Abbasov**
**Azərbaycan dili və onun tədrisi texnologiyası kafedrasının baş müəllimi**

**Kamalə Məmmədova**
**Biologiya və onun tədrisi texnologiyası kafedrasının dosenti**

**Mehri Məmmədova**
**IV tədris ilinin tələbəsi**

Redaksiya heyəti


Professor Cəfər Cəfərov
Müşahidə şurasının sədri


Dosent Eldar Aslanov
Müşahidə şurasının üzvü


Professor Asəf Zamanov
Müşahidə Şurasının üzvü


Professor Fikrət Rzayev
Müşahidə Şurasının üzvü


Professor Mahirə Hüseynova
Müşahidə Şurasının üzvü


Könül Pirverdiyeva
Müşahidə Şurasının üzvü


Tural Cəlilov
Müşahidə Şurasının üzvü


Taleh Mirzəyev
Redaktor


Məhəmməd İsrayılzadə
Redaktor


Nurlan Səmədov
Fotoqraf


Elvin Vahidov
Dizayner

Fotolar Nurlan Səmədovundur. Qəzet "Gənc Müəllim" qəzetinin redaksiyasında yığılıb, səhifələnib və "Azərbaycan Nəşriyyatı" MMC-də çap olunub. Sifariş №: 2411

Ünvan: Bakı şəhəri, Səbail rayonu, Ü.Hacıbəyli küçəsi, 68 / Əlaqə: +994 50 868 08 33 